Bu kitab Azərbaycan Respublikası Dini Qurumlarla İş üzrə
Dövlət Komitəsinin 13 iyul 2017-ci il DK-617/H
nömrəli razılıq məktubu ilə nəşr edilmişdir.

**Kitabın orjinal adı:** Sünneti Reddeden “Kuran Müslümanlığı”

**Müəllif:** Dr.İhsan Şenocak

**Anadolu türkcəsindən Azərbaycan dilinə tərcümə edən:** Firidun Baba oğlu

**Dizayner:** Ülvi Məmmədov

Bakı-2017; Ləman Nəşriyyat və Poliqrafiya MMC -1

# Ön söz

İslama qarşı cəbhə alanlar, Qurani-Kərimin qlobal gücləri təhdid edən, dirildən, hökm edən xüsusiyyətini yanlış təvillərlə yox etmək üçün, Quranın izahı mahiyyətində olan Allah Rəsulunun (s.a.s) Sünnəsini aradan qaldırmaq adına ciddi şəkildə səy göstərməkdədirlər. Bu fəaliyyətə «Quran müsəlmanlığı» adını verərək müsəlmanları bu mübarizəyə qatmağı, xaricdən olduğu kimi, içəridən də İslamı vurmağı hədəfləyirlər. Fərqli aspektlərdən Sünnəyə yönəldilən tənqidlərlə, Qurani-Kərimin Sünnəylə olan bağı qoparılmaqdadır. Beləcə hər kəsin Qurani-Kərimi öz həva və istəklərinə görə anlamasına zəmin hazırlanır.

Orientalizm[1] İslamla birbaşa mübarizə edərək irəliləmədiyini gördükdə, Sünnəni rədd edərək İslamı yox etməyə çalışırlar. Birbaşa Allah Rəsulunu (s.a.s) tənqid etməklə, müsəlmanların nifrətini öz üzərlərinə çəkəcəklərini bildikləri üçün, səhih hədisləri Allah Rəsulunun hüququnu qoruyurmuş kimi göstətərək, rədd edirlər.

Allah-Təalanın Qurani-Kərimi Peyğəmbərimizə nazil etməsi, əslində Peyğəmbərimiz vasitəsilə bu kitabın insanlara izah olunması həqiqətini də özündə daşımaqdadır. "Bəyan" vəzifəsinin Allah Rəsuluna verilməsi, Qurani-Kərimin də açıqlanmağa möhtac olduğu həqiqətini ehtiva edir. Quranla Sünnənin "Bəyan münasibəti" məzmununda zikr edilməsi, biri kimi digərinin də ilahi qoruma altında olduğunu tələb edir. Ayədə keçən "zikr" sözü ümumi mə-

1. Orientalizm-İslam mədəniyyətini öz lehinə araşdıran Qərbin bir layihəsidir.

nada ələ alındığında, Allahın qorunmasını vəd etdiyi risalət, ya da İslam şəriəti olaraq aydın olur. Necə ki, Allah-Təalanın kafirlərin xoşuna gəlməsə də tamamlayacağını vəd etdiyi "nurullah" tərkibi "İslam şəriəti" mənasındadır. Hər nə qədər bəzi təfsirçilər ayədə keçən "zikr" sözündən Qurani-Kərimi anlasa da, bu vəziyyət Allah azzə və cəllənin Sünnəni qorumayacağı mənasına gəlmir. Çünki Qurani-Kərimlə əməl edilməsi başa düşülməsinə, başa düşülməsi də Sünnənin varlığına bağlı olduğuna görə Quranın "mübəyyini" (açıqlaması) olan Sünnənin də, Quran kimi qorunması lazımdır. Çünki bəyan edilənin qorunması, bəyan edənin doğru bir şəkildə mühafizə edilməsinə bağlıdır. Qurani-Kərim ancaq Allahın istədiyi şəkildə başa düşülərsə qorunmuş olar. Əks təqdirdə təhrif edilmiş olur ki, heç bir şəkildə təhrif qorunma əhatəsinə girmir.

Qurani-Kərimin anlaşıla bilməsinin Sünnəyə olan ehtiyacını yaxın planda müşahidə edən səhabələr Kitabın Sünnə tərəfindən açıqlanan heç bir istiqamətinin bağlı qalmaması üçün Allah Rəsulunun (s.a.s) yeməyindən içməsinə, oyaq halından yuxusuna, oturmasından qalxmasına kimi həyatının bütün incə nöqtələrini rəvayət etdi. Necə ki, hədis məcmuaları Səhabənin heç bir detalı keçmədən, Allah Rəsulundan sadir olan hər şeyi rəvayət etdiyi hədislərlə doludur.

Qurani-Kərimin raviləri olan səhabələr, eyni zamanda Sünnənin də ravisi olma vəzifəsini boynuna götürmüş, bir-birilərini sorğulayaraq səhabələrin ədalətilə əlaqəli bütün şübhələri aradan qaldırmışlar. Çünki, başda Hz. Ömər (r.a) olmaqla Səhabənin hədis sorğulaması həmişə bəraatlə nəticələnmiş, həmçinin sonrakı dövrlərdə ediləcək ittihamlar böhtan daxilində qiymətləndirilmişdir.

Allah Rəsulunun hədislərinə fikir vermədən, Sünnəyə baxmayaraq hökm verənlər, "Nə üçün belə edirsiniz?" sualı ilə qarşılaşdıqlarında öz **arzu və istəklərinə uyğun gəlməyən hədislər mütəvatir dərəcəsində belə olsa**, uydurma olduqlarını iddia edə bilirlər. Bu vəziyyətdə ağla belə bir sual gəlir: Sünnəni rədd edənlər "Niyə səhabənin rəvayət etdiyi Sünnəni inkar edir də, onların nəql etdiyi Quranı qəbul edir? Onlar Qurani-Kərimi rəvayət

edərkən etibarlı, hədisləri nəql edərkənmi -əstağfirullah - xəyanət içərisindədirlər?! Onların hər bir nassı mühafizə etmə metodu eyni deyilmi? Qurani-Kərimi mühafizə edərkən müvəffəqiyyətli olanlar, nə üçün Onun mübəyyini (açıqlaması) olan və qorunması özünün mühafizəsinə bağlı olan Sünnəni, əzbərləmə nöqtəsində aciz qalsınlar?!

Qurani-Kərimin tarixi proses içərisində məruz qaldığı hücumların ən təhlükəlilərindən olan Sünnəni rədd edən hədis inkarçılığı, bu gün gəldiyi nöqtə etibarilə Ümmətdən, O Ümməti var edən İslam mirasından şübhə edər hala gəlmişdir. Məsələnin ciddiliyini görüb elm üçün yollara düşən minlərlə tələbələrdən bir qardaşımız, dərsləri arasında bizim mövzu ilə əlaqəli yazılarımızın bir qismini Azərbaycan dilində, siz can qardaşlarımla görüşdürdü.

Səhabə zamanında İslamla tanış olan və əsrlərdir də elə qalan Azərbaycana və oradakı insanlığın üz ağı olmağa namizəd gənc qardaşlarıma sevgilərimi ərz edərkən, onlara bu əsərin çatması üçün xeyli məşğul olan tələbə qardaşıma da təkrar sevgilərimi ərz edirəm.

**İhsan ŞENOCAQ**

# SÜNNƏYƏ UYDURULMUŞ DİN DEYƏN "HƏDİS İNKARÇILIĞI" KİMİN LAYİHƏSİDİR?

Quranı ideologiyalarına əsas göstərmək istəyənlər, Quranın ümumbəşəri olan hökmlərini fasid təvillərlə ortadan qaldırmağa çalışırlar. Bunun üçün də Quranın açıqlayıcısı sayılan Allah Rəsulunun Sünnəsinə qarşı mübarizə aparır, Sünnəni ortadan qaldırmaq üçün əllərindən gələni edirlər. Özlərinə «Quran müsəlmanlığı» adı verərək etdikləri ilə özlərini sığortalamaq istəyirlər. İngilis layihəsi olan və Hindistandakı müsəlmanlar arasında ortaya çıxan «Quraniyyun» hərəkatı də bənzər metodu təqib etmiş, Allah Rəsulunun ﷺ «Əhlullah» olaraq xarakterizə etdiyi «Əhlul-Quranı öz məqsədləri istiqamətində istifadə edərək, özlərinə haqq qazandırmaq üçün mötəbər terminlərdən istifadə edir, guya İslamı "əhya" etməyə çalışırlar. Orientalizmin müsəlmanlar tərəfindən rədd olunan iddiaları indi sapı özümüzdən olan baltalar tərəfindən yenidən qəbul etdirilməyə çalışılır. Onlar tərəfindən Sünnəyə yönəldilən tənqidlərlə Qurani-Kərimin Sünnə ilə əlaqəsinin qoparılmağına cəhd edilir. Sünnəni rədd edənlər, Peyğəmbərə qarşı çıxsalar dini "əhya" edə bilməyəcəklərini anladıqlarına görə hədislərin səhih olmadığı və ya cəmi bir neçə yüz səhih hədis olduğu iddiasını ortaya atmışlardır. Bu hərəkətləri ilə hədislərin geri qalanının uydurma olduğunu deyərək özlərinə görə hədisləri niyə qəbul etmədiklərinin cavabını verməyi qarşılarına "məqsəd" qoymuşlardır.

Allah-Təala Qurani-Kərimi Peyğəmbərimizə onu izah etmək üçün nazil etmişdir. Bu da məsələnin hansı məcrada ələ alınması lazım olduğunu təyin edir. "Bəyan" vəzifəsinin Allah Rəsuluna ﷺ verilməsi, Qurani-Kərimin onun tərəfindən izaha ehtiyacı olduğunu diqqətə çatdırır.

Sünnə Quranı açıqlayıcı mahiyyətdədir. Hər ikisi ilahi inayət altındadır.[2]

Ayədə keçən "zikr" sözü ümumi mənada götürüldükdə Allahın qorunmasını vəd etdiyi risalət, ya da İslam şəriəti olaraq aydın olar. Necə ki Allah-Təalanın kafirlərin xoşuna gəlməsə də, tamamlayacağını vəd etdiyi "nurullah" ifadəsi[3] «İslam şəriəti» mənasındadır. Bəzi təfsirçilər ayədə keçən «zikr» kəlməsinin Qurani-Kərim mənasında işlədildiyini desə də Allahın Sünnəni qorumayacağı mənasına gəlmir. Qurani-Kərimin Sünnəyə olan ehtiyacını müşahidə edən səhabələr Quranı anlamaq üçün Allah Rəsulunun ﷺ həyatını bütün detalları ilə nəql etmişlərdir. Necə ki, hədis kitabları səhabələrin Allah Rəsulundan ﷺ sadir olan hər şeyi rəvayət etdiyi hədislərlə doludur.[4] Quranın raviləri olan səhabələr eyni zamanda Sünnənin də ravisi olmaq vəzifəsini boyunlarına götürmüş, bir-birilərini də sorğuluyaraq səhabənin ədaləti ilə əlaqəli bütün şübhələri aradan qaldırmışlardır. Çünki başda Hz. Ömər (r.a) olmaqla səhabənin hədis sorğulaması həmişə bəraətlə nəticələnmiş, beləcə də sonrakı dövrlərdə atılacaq ittihamlar böhtan kimi qiymətləndirilmişdir. Allah Rəsulunun hədislərinə baxmadan Sünnəyə rəğmən hökm verənlər "Niyə belə edirsiniz?" sualına mütəvatir olan hədislərə uydurma deməklə kifayətlənirlər.

Bu vəziyyətdə ağıla belə bir sual gəlir: "Hədis inkarçılar"ı "Niyə səhabənin rəvayət etdiyi Sünnəni inkar edir, lakin onların nəql etdiyi Quranı qəbul edirlər? Onlar Qurani-Kərimi rəvayət edərkən doğru, hədisləri nəql edərkən səhv yolda idilər? Onların

2 Hicr, 15/9.

3. Tövbə, 9/32.

4. İbn Saləh, *Ulumul-Hədis;* Təhqiq, Nurəddin İtr, 1981, s, 12.

hər biri nəssi mühafizə xüsusunda eyni deyilmi? Quranı mühafizə edərkən müvəffəqiyyətli olanlar nə üçün onun mübəyyini olan və qorunması özünün mühafizəsinə bağlı olan Sünnəni hifz etmək nöqtəsində aciz qalsınlar?!

## Səhabənin Sünnə həssaslığı

Allah Rəsulunun ﷺ hədislərini himayə edə bilmək üçün ilk səfərləri səhabələr başlatmışdır. Cabir bin Abdullah bir hədisi öyrənmək üçün Mədinəyə bir aylıq məsafədə olan Şama Abdullah bin Üneysin yanına getmişdir. İbn Həcər səhabələrin hədis öyrənməyə olan rəğbətinə Cabirin bu səfərini qiymətləndirirərkən belə deyir: "Cabir b. Abdullahın Abdullah bin Üneysdən özünə rəvayət edilən hədislə kifayətlənməyib onu şəxsən Abdullah bin Üneysdən dinləmək üçün Şama getməsi, səhabələrin ali isnada verdiyi əhəmiyyəti göstərir. Bu nöqtədə Əbul-Aliyə də belə deyir: "Biz Allah Rəsulunun ﷺ səhabələrindən nəql edilən hədisləri dinləyər, buna razı olmayıb onların yanına gedər, şəxsən hədisi özlərindən öyrənərdik. Fərdi olaraq və ya camaat halında hədisləri müzakirə edər və bu şəkildə yadda saxlayardıq.[5] Əbu Hüreyrə də gecəni üç hissəyə ayırar, üçdə birində namaz qılar, üçdə birində yatar, üçdə birində də Allah Rəsulunun ﷺ hədislərini oxuyardı.[6] Səhabələr, tabeuna da hədisləri mühafizə etmək üçün öz aralarında "müzakirə" etməyi təklif etmişdilər. Bu nöqtədə Ənəs b. Malik şagirdlərinə belə deyərdi: "Biz Allah Rəsulunun ﷺ yanında hədisi eşidər, oradan ayrılandan sonra əzbərləyənə qədər təkrar edərdik".

Necə ki, Ata b. Əbi Rəbah da İbn Abbasın mövzuyla əlaqəli belə dediyini rəvayət edir: "Məndən bir hədis eşitdikdə onu aranızda müzakirə edin.[7] Səhabələrin hədis müzakirəsi və bu xüsusdakı təlqinləri tabeun dövründə hədis halqalarının yayılmasına zəmin

---

5. İbn Həcər, *Fəthul-Bəri,* Darus-Səlam, Riyad, 2000, I, s, 210.
6. Bağdadi, *əl-Camili-Əhləqir-Ravi və Ədəbis-Səmi,* Məktəbətul-Məarif, Riyad, 1989, II, s, 399.
7. Hakim, *Müstədrək,* İlim, H. No: 324.

hazırlamışdır. Sonrakı dövrlərdə isə hədislərin səhihini zəifindən ayıran, sənəd-mətn təhlili edən mühəddislər gəldi. Allah-Təala bir sövqi-ilahi ilə Qurani-Kərim kimi Sünnəni də mühafizə edəcək bir nəslin yetişməsi üçün səbəblər xəlq etdi.

### Rəvayət sistemi

İnsan həyatının araşdırılmasının haram olmasına[8] baxmayaraq mühəddislər rəvayət sistemi içərisində iştirak edən hər bir ravinin həyatını ətraflı araşdırmış və bu məzmunda təxminən beş yüz min insan haqqında məlumat vermişlər. Bir halqada hədis rəvayət edilərkən bu sahəyə bələd olanlar rəvayət zəncirindəki raviləri tanıyar, dərhal hamısı haqqında hökm verə bilirdilər. Müctəhid imamların ictihad halqalarında da mühəddislər olurdu. Səhabələrin hədislər mövzusundakı həssaslığı, bir rəvayəti nəql edərkən "Kəənni ənzuru alə Rasulilləhi" (Sanki indi Allah Rəsuluna ﷺ baxıram) şəklindəki hadisəyə vaqif olduqlarını bildirən sözləri, bu sahədə böyük bir ciddiyyət olduğunu göstərir. Çünki Qurani-Kərim bir çox ayəsində Allah Rəsuluna ﷺ tabe olmağı əmr etməkdədir. Allah-Təalanın qorunmayacaq bir Sünnəyə tabe olmağa çağırması, sonra da xurafatlarla əməl edənlərdən bunun hesabını soruşması Onun ədalətinə sığmaz. Hansı müsəlman Allah-Təalaya belə bir şeyi isnad edə bilər? Bu vəziyyətdə Allah Rəsuluna ﷺ itaət etməyi əmr edən hər ayə Sünnənin qorunmuş olduğunu da elan edir. Qurani-Kərimdə ən çox vurğulanan təlimatlardan biri də Allah Rəsuluna ﷺ itaətdir. Bir çox surədə bu nüansı ehtiva edən ayələr vardır. Bir qrup insan, "Ey Muhamməd! Biz Rəbbimizi sevirik" dedikdə;[9] Allah-Təala "Peyğəmbərə itaət" olmayan mücərrəd bir sevginin etibarsız olduğunu bəyan edərək buyurmuşdur: **"(Ya Rəsulum) De ki: "Allahı sevirsinizsə, mənim ardımca gəlin ki, qarşılığında Allah da sizi sevsin və günahlarınızı bağışlasın"**.[10]

---

8. Hucurat, 49/1.

9. Əbdül-Mehdi Əbdül-Qadir, *əl-Mədhal ilas-Sünnə,* Darul İtisam, Qahirə, 1998, s, 79.

10. Ali-İmran, 3/31.

Allah Rəsuluna tabe olmaq və Onu sevmək ilahi sevgiyə, Ona qarşı gəlmək isə əzaba məzhər olmaqdır.

İnsanların ilahi mərhəmətə nail olmaları kimi, cənnətə girmələri də Allaha itaətlə yanaşı Allah Rəsuluna ﷺ itaətə bağlanmışdır.[11] Allah Rəsuluna ﷺ itaəti əmr edən hər ayədən sonra bu həqiqəti təkrar etməliyik. Onlar Sünnənin Quran kimi qorunacağı vədinin olmadığını iddia edirlər. Əgər belədirsə, bu gün aramızda Sünnəsi yaşayan Peyğəmbərə necə itaət ediləcəyi haqqında fasid təvillərə müraciət etmədən cavab versinlər. Quranda eyni ayədə Allaha itaətdən sonra Rəsuluna itaət əmr olunur. Bu da o deməkdir ki, peyğəmbərin təbliğ elədiyi Quran kimi, onun gətirdiyi Sünnə də əhəmiyyətlidir. Yəni Qurana tabe olunduğu kimi Sünnəyə də tabe olunmalıdır.

Madam ki, Allah Rəsulu ﷺ Rəbbindən aldıqlarını təbliğ etmişdir, o halda gətirdiyi də, bildirdiyi də Rəbbini razı edəcək həqiqətlər olmuşdur. Bu da Allah Rəsuluna ﷺ itaət etməyin Allaha itaət etmək səviyyəsində olduğunun sübutudur.

Çünki Quranda **“Kim Rəsula itaət etsə, şübhəsiz ki, Allaha itaət etmiş olur”**[12] buyurulur. İslam, Allah Rəsulunun ﷺ sünnəsi ilə kamil olduğundan müsəlmanlar aralarında hökm etmək üçün Allaha və Rəsuluna çağırıldıqda “Eşitdik və itaət etdik” deyərlər.[13] Allah-Təala Sünnəyə tabe olmağın qaçınılmaz olduğunu müsəlmanlara öyrətmək üçün həqiqətdə hökm Ona aid olduğu halda لِيَحْكُمَ بَيْنَهُمْ [14] sözündəki əvəzliyi “təsniyə” yerinə “müfrəd” olaraq zikr edərək Allah Rəsulunun ﷺ yalnız başına hökm edəcəyinə işarə etmişdir. Necə ki alimlər Sünnənin Quranın mücməlini açıqlayan, mütləqini təqyid edən, ümumiyyətlə, ifadə edən nizamını təsis edən istiqaməti yanında hökmü Qurani-Kərimdə bəyan edilməyən mövzularda müstəqil olaraq hökm qoyan bir qaynaq olduğunu ifadə etmişlərdir.

11. Ali-İmran, 3/132; Nisa, 4/13.

12. Nisa, 4/80.

13. Nur, 24/51.

14. Nur , 24/51.

Namazların hansı vaxtlarda, neçə rükət və necə qılınacağı, hansı rükunlarda nələrin oxunacağı (rüku və səcdə xaric), orucun necə tutulacağı, zəkatın hansı mallardan və nə qədər veriləcəyi, həccin necə ediləcəyi kimi xüsuslar Quranda olmadığından Allah Rəsulunun ﷺ Sünnəsi ilə bəyan edilmişdir. Fiqh kitablarındakı müddəaların əksəriyyəti hədislərə əsaslanır. Sünnədə eyni zamanda Qurani-Kərimdə olmayan bir çox məsələnin hökmü bildirilmişdir. Qadınların aybaşı hallarında ibadət etməli olduqlarını müdafiə edənlərin az qala hamısının “Quran müsəlmanı” olması əslində nə üçün Sünnəni inkar etdiklərinin də cavabıdır. Sünnəyə baxmayaraq din adından fitva verənlərin, günahsız bir Peyğəmbərin Sünnəsininin əhəmiyyətli bir qismini Qurana zidd saymağı, özlərinə təqsirsizlik isnad etmələri mənasına gəlir. Günahkarların hökm qoyduğu bir zamanda günahsız bir Peyğəmbərin müstəqil olaraq hökm verməsindən nə üçün narahat olurlar? Allah Rəsuluna ﷺ müxalifət etməyi qadağan edən ayələr də Peyğəmbər olmadan İslamdan bəhs etməyin dünyada pozğunluğa, axirətdə isə cəhənnəmə girməyə səbəb olduğunu ifadə etməkdədir. **“Allah və Rəsulu bir məsələdə hökm verdiyində inanmış bir kişi və qadın üçün o məsələni öz istəklərinə görə seçmək haqqı yoxdur. Hər kim Allah və Rəsuluna qarşı gələrsə, açıq-aşkar bir azğınlığa düşmüşdür”**.[15] Quranı insanın istəklərinə uyğun anlamaq üçün “Sünnəni kənara “atmaq” lazımdır” düşüncəsinə şərait yaratmamaq üçün Rəsulullaha üsyan sapıqlıq kimi qiymətləndirilmiş, ona üsyan da Allaha üsyan olaraq bildirilmişdir.

İxtilaf edilən bir mövzu barədə Allah Rəsulunu ﷺ rəhbər götürməyənlərin müsəlman olaraq qəbul edilə bilməyəcəyi bildirilir.[16] Allaha, Rəsuluna və müsəlman idarəçilərə itaət etməyi, mübahisəni isə mövzunu Allaha və Rəsuluna ərz edərək ilahi ya da nəbəvi göstərişlərə görə həll etməyi əmr edən ayədə[17] də keçən إِلَى اللَّهِ - dan məqsəd Allahın Kitabı; وَالرَّسُولِ -dən məqsəd isə Allah Rəsulunun ﷺ Sünnəsidir.[18] Bundan əlavə أَطِيعُواْ اللّهَ وَأَطِيعُواْ الرَّسُولَ وَأُوْلِي الأَمْرِ مِنكُمْ, ayə-

15. Əhzab, 33/36.

16. Nisa, 4/65.

17. Nisa, 4/59.

18. İbn Əbdilbərr, *Camiu Bəyanil-İlm,* Dar İbnul Cövzi, 1994, I, s, 765.

sindəki أَطِيعُوا felinin "Allah" və "Rəsul" kəlmələrindən əvvəl qeyd edilməsi, buna müqabil "ulul-əmr"dən əvvəl gəlməməsi, Allah Rəsuluna Quranı təbliğ xaricindəki xüsuslarda itaət edilməli olduğuna işarədir.

Necə ki "ulul-əmr"-dən əvvəl أَطِيعُو hərəkənin hazf edilməsi və «Rəsuli» sözü üzərinə ətf edilməsi, idarəçilərin müstəqil olaraq itaət edilən olmadıqlarını və buna görə də onlara itaətin ancaq Peyğəmbərə tabe olmaq şərti ilə doğru olacağını isbat edir.[19] Allah Rəsulunun ﷺ Sünnəsinin "vəhy"[20] olduğunu bəyan edən Qurani-Kərim ona itaətdən üz çevirməyi də küfr olaraq xarakterizə edir. Qurani-Kərim bir çox ayədə Allah Rəsuluna ﷺ tabe olmağı əmr edir, ona müxalifəti «küfr» olaraq xarakterizə etməklə qulların ilahi məhəbbətə vasil ola bilmələrinin yolunun da Peyğəmbərimizə tabe olmaq olduğunu bəyan edir. Bu gün Allah Rəsulu ﷺ aramızda yoxdur ancaq Quranın ayələri bütün zaman və məkanları əhatə edir. Buna görə insanlar Allah Rəsuluna ﷺ itaət əmrini, onun Sünnəsinə əməl edərək yerinə yetirməlidir. Qurani-Kərimin Sünnə işığında başa düşülməsini "uydurulan din" olaraq görüb, Sünnənin Qurani-Kərim kimi qorunduğu həqiqətini rədd edənlər bu hallarıyla Allahın, Rəsuluna itaəti əmr edən ayələrini və müsəlmanların səhih olmağında ixtilaf etmədiyi hədisləri "xurafat" adlandırmaqdadırlar. Quran tarixi olmadığına və hər bir ayə zaman və məkan üstü həqiqətləri ehtiva etdiyinə görə Allah Rəsulu ﷺ aramızda olmadığı halda bu qədər ayə ümməti Peyğəmbərə itaət etməyə çağırdığına əksinə bir halın "küfr" olduğu icma ilə bilindiyinə görə "Rəsulə itaət edin" şəklindəki ayənin izahı odur ki, o da Sünnənin tamamilə vəhy qəbul edilməsidir. Allah- Təala, Kitabının muradı ilahi çərçivəsində başa düşülməsini təmin üçün onun açıqlayanı olan Rəsulunun Sünnəsini də mühafizə etmişdir. Əksi əstağfirullah uydurulmuş hədislərə tabe olmağı əmr etdiyini iddia etmək olar ki, bu da söyləyən üçün fəlakətdir

19. İbn Qayyim əl-Cəvziyyə, *İlamul-Muvəkkin,* Darul Kutubil İlmiyyə, Bəyrut, 1996, I, s, 48.

20. Nəcm, 53/ 3-4.

# KİLSƏNİN ƏN SON VƏ ƏN TƏHLÜKƏLİ OYUNU: SÜNNƏNİ RƏDD EDƏN "QURANİLƏR FİRQƏSİ"

Kilsə, tarix boyu Qurani-Kərimlə Allah Rəsuluna ﷺ iftira atmışdır. Onun şəxsinə dair yalanlar uydurmuş, sonra da o yalanları "həqiqət" niyyətinə əsrlərcə dərs kitablarında oxutmuşdur. Peyğəmbərimizə "xəstə", "yalançı peyğəmbər", "dəccal" kimi atılan böhtanlar kilsələrdə təbliğ olunmuşdur. İslam, doğrularıyla məhkum; Qərb isə yalanlarıyla qəhrəman olmuşdur. "İstismarın kəşf qolu» olan Orientalizm (Şərqşünaslıq) də eyni yalanlardan bəslənmişdir. Buna görə Montgomery Watt tarixi proses içərisində heç bir böyük şəxsiyyət Hz. Muhamməedin Qərbdə pisləndiyi qədər pislənməmişdir, - demişdir.[21] Kilsənin Allah Rəsuluna ﷺ dair uydurduğu yalanlarına aldanıb İslamla döyüşənlər fəthlərlə İslamın ədalətini görüncə həqiqətlə üzləşdi, müsəlman oldu. Dünya daxilində həyata keçirilən missionerlik işlərinə baxmayaraq, heç bir müsəlman İslamdan xristianlığa keçmədi. Lakin Misir, Suriya, Anadolu başda olmaqla bir çox bölgədə insanlar səhabələri görən kimi müsəlman olmuşlar. İslamın öz torpaqlarında yayılmağına mane ola bilməyən Kilsə qeyri-əxlaqi hücumlarını həyatın demək olar hər sahəsinə daşıdı; bu çərçivədə xüsusi insanlar yetişdirib Mədinəyə göndərdiyi adamları vasitəsi ilə Allah Rəsulunun ﷺ nəəşini qaçırmaq üçün də cəhd etdi.

---

21. Montogomery Wat, *Muhammad at Madina,* Oxford Unverisity Press Oxford, s, 324,1956.

**Qurtar məni Nurəddin!**

Səlcuqlu Atabəyi Nurəddin Mahmud Zənginin qarşısında məğlubiyyətə uğrayan xaçlılar, müsəlmanları mənəvi olaraq zəiflədə bilmək üçün Allah Rəsulunun mübarək bədənini məzarından qaçırıb Avropaya aparmaq üçün iki adamı vəzifələndirdi.

Çox gözəl şəkildə ərəbcə bilən və məğribli paltarıyla Mədinəyə gedən bu iki şəxs orada Rövzeyi-Mutəhhərənin qiblə tərəfinə yerləşdi; niyyətlərinə çata bilmək üçün həftələrcə müsəlman kimi hərəkət etdilər. O qədər ki, Nurəddin Zəngi soruşduqda, mədinəlilər onlar haqqında: «Bunlar davamlı oruc tutar, beş vaxt namazı Rövzədə qılar, Peyğəmbərimizin qəbirini ziyarət edər, hər səhər, içində on min səhabə yatan Bəqi Qəbiristanına, hər şənbə də Quba Məscidinə gedər və əsla heç bir dilənçini geri çevirməzlər” dedilər.

Qıtlıq ilində etdikləri infaqlarla Mədinə əhlinin etibarını qazanan bu iki xristian, hər gecə evlərindən Allah Rəsulunun ﷺ qəbri-şərifinə doğru tunel qazmaqda, çıxan torpağı da üzərlərindən heç çıxarmadıqları əbanın içində daşımaqda idilər. Tunelin, Allah Rəsulunun qəbrinə yaxınlaşdığı günlərdə Nurəddin Zəngi təhəccüdü qılıb zikirləri etdikdən sonra istirahətə çəkilir. Yuxuya daldığı əsnada yuxusunda Allah Rəsulu ﷺ zühur edib bu iki qumral adamı göstərir və “Mənə kömək et, məni bu iki adamdan qurtar!”, - buyurur. Nurəddin Zəngi qorxuyla oyanır, dəstəmaz alır, namaz qılır, təkrar yatır və eyni yuxunu görür. Oyanır, namaz qılır, yatır və yuxunu üçüncü dəfə görüncə qalxır, “yuxum qaçdı” deyir. Gecə vəziri Cəmaləddin Məvsilini adam göndərib çağırtdırır, yuxusunu ona danışır və fikrini soruşur. Vəzir də “Niyə dayanırsınız ki? Mədineyi-Münəvvərəyə hərəkət edin, gördüklərinizi də kimsəyə danışmayın, Sultanım! - deyir. Nurəddin Zəngi gecə vaxtında yol hazırlaşaraq, kimsəyə bildirmədən yanında vəziri, Mədinə xalqına paylamaq üçün ərzaq və 20 süvariylə Şamdan Mədinəyə doğru yola çıxır. 16 günə Mədinəyə çatır. Şəhərin xaricində qüsl alır, sonra Ravzaya gedib namaz qılır, sonra da Allah Rəsulunun ﷺ qəbrini ziyarət edir. İnsanların məsciddə toplandığı, onun da nə edəcəyini bilməz bir halda oturduğu bir vaxtda vəzir Cəmaləddin belə deyərək xalqa səslənir: «Sultan Peyğəmbərimizi ziyarətə gəl-

di. Mədinə xalqına da sədəqə gətirdi. İndi bütün mədinəlilərin adlarının yazılı olduğu bir siyahı hazırlayın!". Bununla vəzifəli olanlar xalqın hamısının yazıldığı bir siyahı hazırlayaraq, onları bir yerdə topladılar. Siyahıda adı olanlar bir-bir Sultanın hüzuruna çıxır, hədiyyəsini alıb gedirdilər. Bu vaxt Sultan hədiyyə almaq üçün gələnlərin üzünə diqqətlə baxır, Allah Rəsulunun ﷺ yuxuda özünə göstərdiyi o iki adamı axtarır, lakin tapa bilmirdi. Hədiyyə verdiklərini göndərir, digərlərinə diqqətlə baxır, lakin yenə də yuxudakı kimi bir adama gözləri ilişmirdi. Nəhayət, hər kəs hədiyyəsini aldı, siyahıda adı olanlardan kimsə qalmadı. Lakin hələ Sultan yuxusundakı iki adamı görə bilməmişdi. Bunun üzərinə ətrafda gözləyən mədinəlilərdən "Sədəqə almayan kimsə qaldımı?" deyə soruşdu. Onlar da, "Xeyr" dedilər. Sultan: "Yaxşıca düşünün!" - dedi. Bunun üzərinə, "Heç kimə bir şey etməyən Məğribli iki adam var. Onlar da möhtaclara çox sədəqə verən saleh və zəngin insanlardır", - dedilər. Sultan bunu eşidincə rahatladı. "O iki adamı dərhal mənə gətirin" - deyə əmr etdi. Az sonra iki adam gətirildi. Məğriblilər Sultanın hüzuruna girəndə ortalığı dərin bir səssizlik bürüdü. Nurəddin Zənginin qarşısında Allah Rəsulunun ﷺ işarə buyurub "Məni bunlardan qurtar" - dediyi iki qumral adam dayanmışdı. Sultan bunu bir müddət sonra bildi. Onlara haralı olduqlarını soruşdu. Onlar da "Məğribdənik; Həcc üçün gəldik və bu ili də Allah Rəsulunun ﷺ yanında keçirmək istədik", - dedilər. Bunun üzərinə Sultan, "Mənə doğru söyləyin", - deyə onları xəbərdar etdi. Onlar isə israrla doğru söylədiklərini iddia etdilər. Sultan "Yaxşı eviniz haradadır?", - deyə soruşdu. Məscidin yaxınlığında bir ribatta qalırıq", - dedilər. Sultan onların evinə getdi. Evdə hər şey normal idi. Mədinəlilər də onların xeyir sahibi olduqlarına şəhadət edirdi. Nurəddin Zəngi "Sübhənallah! Yuxuda gördüklərimdən bir şey ortaya çıxmadı" - deyə zümzümə etdi. Evin içərisində gəzərkən yerdə bir həsir gördü, əyilib qaldırdı. Elə bu vaxt Allah Rəsulunun ﷺ qəbrinə doğru gedən bir tunel gördü.

Kilsənin bu iki vəzifəli şəxsi günahlarını etiraf edincə Nurəddin Zəngi onları edam etdirdi.[22] Qurani-Kərimlə Allah Rəsulunu ﷺ

22. Nurəddin bin Əli ibn Əhməd əs-Samhudi, *Vəfaul-Vəfa bi Əxbari Daril-Mustafa,* Darul-Kutubil-İlmiyyə, Beyrut, 2/648-652.

hədəf alan kilsə, mərkəzində Peyğəmbər olmayan bir dinin dağılacağını düşündüyündən hər vəsilə ilə oxları Allah Rəsuluna ﷺ çevirirdi. Lakin **“Allah səni insanlardan qoruyacaq. Həqiqətən, Allah kafir camaatı düz yola yönəltməz!”**[23] ayəsi təcəlli etdi; Peyğəmbərini yaşayarkən qoruyan Allah vəfatından sonra da onu mühafizə etdi. Maddə planında hədəflərinə yaxınlaşdıqları anda Nurəddin Zəngini vəsilə edərək onlara ölümü daddırdı. Nurəddin Zəngi hadisənin bir daha təkrar olmaması üçün Allah Rəsulunun ﷺ qəbri ətrafına dərin bir xəndək qazdırdı. Sonra da bu xəndəyə əridilmiş qurğuşun tökdü; Kilsə işçilərinin açdığı tunel də bağlandı. Mədinədə müsəlmanlar rahatladı; Allah Rəsulu ﷺ ilə Qurani-Kərim üzərindən intiqam almaq istəyən kilsənin payına isə matəm düşdü.

### Kilsənin baş aktyorları: Quranilər firqəsi

Hər fəaliyyətlərində yalanları və tələləri əlində qalan kilsə yenə də Qurani-Kərimlə hesablaşmaqdan geri qalmadı. Tarixi proses içərisində mübarizə üsulu dəyişdi, lakin kin, nifrət və sui-qəsd həmişə eyni qaldı. Kilsədən mükafat alan Seyyid Əhməd xanın zamanında XIX əsrin sonlarında Hindistanda ortaya çıxan və Sünnəni həyatdan tamamilə silib yalnız Qurani-Kərimi əsas alan Quraniyyun hərəkatı Quranla Peyğəmbər üzərindən intiqam almağa cəhd edir. Hərəkatın sütununu meydana gətirən, buna görə də qurucusu qəbul edilən Abdullah Çakraləvi Quranın başa düşülməsi və həyata tətbiq edilməsi nöqtəsində risalətin rolunu inkar etdi. Başlanğıcda Quranilərin iki lideri var idi. Bunlardan Mühibbul-Haqq Əzimabadi Hindistanın şərqində; Çakraləvi isə Lahorda düşüncəsini yaymaqda idi. Əzimabadi zahirdə müsəlmanlara müxalifət etmir; lakin bütün hökmləri Qurani-Kərimdən çıxarırdı. Çakraləvi isə nə etmək istədiyini ilk illərdə izhar etdi. Adı “Əhluz-Zikri vəl-Quran” olan bir təriqət meydana gətirdi.

---

23. Maidə, 5/67.

### Parçala və hökmranlıq et

Hindistanda 1857-ci ildə başlayıb, 1858-ci ildə qarşısı alınan qiyam ilə İngilislər ciddi mənada sarsılmış və etibarlarını itirmişdi. Müsəlmanların birləşib tək bir bayraq altında təkrar hücuma keçmələrinin qarşısını almaq üçün Pakistan və Banqladeşi Hindistandan qoparmağın planını hazırlayan ingilislər, müsəlmanları bir-birindən qalın xəttlərlə ayıra bilmək üçün fərqli təriqətlərin meydana gəlməsinə nail oldular. Əhli-Sünnə qarşısında tarix olan məzhəblərə dair nə qədər xurafat varsa, hamısı arxivlərdən elm məclislərinə çıxarıldı. Alimlər daxili qarşıdurmanın içinə çəkilərək, yol göstərəcək mətnlər yazmaqdan məhrum edildi. “Bizə Quran yetər!” - deyən Quraniyyun hərəkatı müsəlmanlar içərisində bir bölünməyə səbəb olması cəhətilə ingilislərin **“Parçala və hökmranlıq et”** anlayışına xidmət etdi.

Hindistanda daimi olaraq qalmağı hədəfləyən İngiltərə, Seyid Əhməd Xan kimi ingilislərin mənfəətləri üçün dini vasitə etməkdən çəkinməyən insanlar tapmaqda çətinlik çəkmədi. İngilislər, onların fikirlərinə xidmət edənlərə, maddi mənada kömək olduğu kimi onların etibarını da yüksəltdi. Qulam Əhməd Qadiyani və Çakralevi kimi adlar da ya birbaşa, ya da bilvasitə olaraq məşhurlaşdırıldı. Hansı ki bunların saylarının artması müsəlmanların bir-birilərilə olan ixtilaflarının daha da dərinləşməsinə səbəb oldu. Beləcə də elm tələbələri İngilis işğalıyla deyil, dinini təhrif edən adamlarla mübarizə etmək məcburiyyətində qaldı. Quraniyyun da digər bütün firqələr kimi ümmətin tək bayraq altında toplanması tələbilə meydana çıxdı. Tövhiddən bəhs etdikləri halda, özləri kimi düşünməyənləri şirkə düşməklə ittiham etdilər.

### Ziddiyyətlər topluluğu: Quran müsəlmanlığı

Əshabi-kiram İslami hökmləri Qurani-Kərimdən və Allah Rəsulunun ﷺ Sünnəsindən almışdır. İslam alimləri də, Sünnənin ikinci qaynaq olduğu mövzusunda icma etmişlərdir. Hansı namazın neçə rükət olduğu, zəkatın nə qədər maldan, hansı nisbətdə veriləcəyi, həccin necə ediləcəyi kimi Qurani-Kərimin xüsusi olaraq buyurdu-

ğu xüsusları Sünnə təfsir etmişdir. Bu nöqtədə Sünnə, Qurani-Kərimi o dərəcə bəyan etmişdir ki, "Əgər Sünnə olmasaydı Quranın bir qisimi anlaşılmaz, namaz, zəkat, həcc daxil bir çox xüsuslar möminlərin nə olduğunu tam olaraq dərk edə bilməyəcəyi əmrlər olaraq qalar və ədaları qeyri-mümkün olardı". Bunun üçündür ki, Allah **"Biz onları (peyğəmbərliklərinin doğru olduğunu sübut edən) açıq-aşkar möcüzələr və kitablarla göndərdik. Sənə də Quranı nazil etdik ki, insanlara onlara göndərilləni (hökmləri, halal-haramı) izah edəsən və bəlkə, onlar da düşünüb dərk edələr!"**[24] buyurmaqdadır.

Nə var ki Sünnəni rədd edərək Qurani-Kərimi anlaşılmaz hala gətirmək, sonra da onu qlobal istismar sisteminin mənfəətlərini təhdid etməyəcək bir məzmunda həva qəliblərinə töküb formalaşdırmaq istəyən Məalçılar Allah Kəlamının nə olduğunu alimlərin dərs halqalarında öyrənmədiklərindən onu idrak etməkdən də məhrum olmuşlardır. Yaşanan bu məhrumiyyətin əsas səbəbi isə "Doğrunun nə olduğunu bilmədiklərindən Qurani- Kərimə dair ilk duyduqlarını "doğru" qəbul etmələridir. Buna görə aşağıda təhlil edəcəyimiz iddialara "Məalçılığın sütununu meydana gətirən dəlillər" olaraq sarılıb Sünnəyə rəqib oldular.

24. Nəhl, 16/44.

## QURANİYYUN FİRQƏSİNİN İDDİALARI VƏ HƏQİQƏTLƏR

**Birinci iddia: "Quran bizə yetər":**

Bu düşüncədə olan insanlara görə Qurani-Kərimdə hər şey vardır. Hər mövzuda o bizə yetər. Müsəlmanlar İslama görə bir həyat yaşamaq üçün Sünnəyə möhtac deyillər. Bu nöqtədə Çakraləvi bunları deməkdədir: «Qurani-Kərim dində özünə ehtiyac duyulan hər şeyi, hər cəhətdən ətraflı bir şəkildə bəyan etmişdir. O halda Sünnəyə nə ehtiyac olsun?"[25] Başqa bir vəsiləylə isə belə deyir: "Allahın Kitabı kamil olmaqla birlikdə tam olaraq da açıqlanmışdır. Aydın olmaq üçün nə şərhə, nə Muhammədin onu təfsir etməyinə ehtiyac vardır".[26]

**Cavab: Quran üsul, Sünnə isə əsasdır:**

Qurani-Kərimdə İslamın təməl əsaslarını ehtiva edən bir çox ayənin olduğu bir həqiqətdir. Lakin onun kiçik, böyük hər şeyi əhatə etdiyini demək isə normal bir ağlın məhsulu ola bilməz. Çakraləvinin iddia etdiyi kimi Qurani-Kərim, Sünnəyə möhtac deyilsə, bu ümmət beş vaxt namazın nə olduğu və necə qılınacağı nöqtəsində hansı ayəyə müraciət etməlidir? Hər bir fərz namaz neçə rükət olmalıdır? Namaz qılan ayaqda, rükuda, səcdədə nə

25. Çakraləvi, *Məcəllətu İşaatil-Quran,* sy 3, 1902, s, 49,

26. Hədim Hüseyin, *İlahi Bahş, əl-Quraniyyun,* s.211.

oxumalıdır? Qoyunun, inəyin, dəvənin zəkatı nə qədər olmaldır? Bütün bunların cavabı Allah Rəsulunun ﷺ sünnəsindədir. O da ümmətinə bu xüsusları bəyan etmişdir. Allah-Təala Qurani-Kərimdə daha çox ana əsaslardan və qaydalardan bəhs etmişdir. Arada cüzi məsələlərə girmişdir. **“Peyğəmbər sizə nə verirsə, onu götürün; nəyi qadağan edirsə, ondan əl çəkin”**.[27] Quran daha çox üsul, Sünnə isə əsasdır.

**İkinci İddia: “Sünnə vəhy” deyildir:**

Quranilər, sünnə tamamilə «vəhy» deyil deyərək, Allah Rəsuluna ﷺ yalan olaraq istinad edilən bir sıra sözlər olduğunu iddia etməkdədirlər. Bu nöqtədə Çakraləvi də, **“Biz yalnız Allahın endirdiyi Qurana tabe olmaqla məsuluq. Bəzi hədislərin sənədi səhih bir şəkildə Peyğəmbərə çatdığı fərz edilsə də, onunla mükəlləf olunmaz. Çünki heç biri Allahdan gələn vəhy deyildir”**[28] deyir.

**Cavab: Allah Rəsulu həva və həvəsinə görə danışmaz:**

Quranı insanlara Allah Rəsulu ﷺ təbliğ etmiş və o açıqlamışdır. Allah-Təala nəyi, necə əmr etdisə o da, o şəkildə və o surətdə bəyan etmişdir. Əks halda olacaqları Quran belə bəyan edir: **“Əgər Peyğəmbər özündən bəzi sözlər uydurub Bizə isnad etsəydi, Biz ondan mütləq şiddətli intiqam alardıq. Sonra Onun şah damarını qopardardıq. Heç biriniz buna mane ola bilməzdi”.**[29]

Bu ayəni təbliğ edən peyğəmbərin halal və haramı[202] bildirmək səlahiyyəti olmasaydı bunu etdiyinə görə həyatda qala bilməzdi.

Lakin bu nöqtədə heç bir qüsur olmadığına görə Allah Rəsulunun ﷺ bütün əməllərini şəri ölçülər çərçivəsində etdiyi ortaya çıxır. Ayəyə görə Peyğəmbərin din adına danışdığı hər şey Allah-Təa-

27. Həşr, 59/7.
28. Əl-Mubəhasə, 81.
29. Haqqə, 69/44-47.

lanın muradına uyğun olmalıdır. Bu da ancaq Allahın, Rəsuluna bildirməsi ilə mümkündür. Bu səbəbdən birbaşa dinə aid məsələlər haqqındakı Sünnə də vəhydir.

Çünki səhabələr və sonrakı nəsillər də Sünnəni vəhy qəbul etmişdir.

Əgər Sünnə vəhy olmasaydı - əstəğfirullah - Allaha baxmayaraq danışan bir Peyğəmbərə tabe olduqlarından ötrü səhabələr Allahın kitabında təriflənməzdi.[30]

Səhabələr həm Quranı anlama, həm də başqa məsələlərdə Peyğəmbərimizə tabe olduqlarına görə böyük məsafələr qət etmişlərdir. Dünya nizamını dəyişdirmiş, haqqı hakim qılmışlardır. Dövrün iki böyük imperiyasından birini ortadan qaldırmış, digərini kiçik bir sahədə yaşamağa məhkum etmişlərdir. Peyğəmbərin izində gedən səhabələrin həlak edilməməsi, bir müsibətin onları dağıtmaması, Peyğəmbərdən söz və əməl baxımından gələn rəvayətlərin vəhy olduğunun dəlilidir. Əks təqdirdə Allah-Təala, sünnənin sahibi olan Peyğəmbərimizi və Ona tabe olan səhabələri həlak edərdi. Qurani-Kərim miras kimi, bir neçə xüsus istisna olmaqla əhkamı ana xəttlərilə təyin etmişdir. Təfsilatı isə Quranı bəyan etmə vəzifəsi özünə verilən[31] Allah Rəsuluna ﷺ buraxmışdır. Möminlərə də, Ona itaət etməyi əmr etmişdir.

**Üçüncü iddia: "Sünnəyə vəhy demək hədisləri Qurani-Kərim səviyyəsinə" çıxarar**

Quranilərə görə İslamı bəyan nöqtəsində Peyğəmbərdən nəql olunan sünnəni «vəhy» qəbul etmək, onu Qurani-Kərimin səviyyəsinə çıxaracağı kimi, Quranı da sünnənin dərəcəsinə salır.

**Cavab: Quran sünnə, sünnə də Quran deyil:**

Allah Rəsulu ﷺ Quranla sünnənin bir-birindən ayrılması nöqtəsində son dərəcə həssas davranmış, ayələri dəri parçaları üzərinə yazan səhabələr səhifələrin kənarına hədisləri də yazdıqda onlara ilk mərhələdə bu əməli qadağan etmişdir.

30. Fəth, 48/10.

31. Nəhl, 16/44.

Lakin daha sonra dövlət başçılarına göndərdiyi məktublar daxil olmaqla bir çox hədisi şəxsən yazdırmış; "Əbu Şah üçün yazın"[32] buyurmuşdur. Alimlər də Quranla sünnəni qəti xəttlərlə bir-birindən ayırmışdır:

1. Qurani-Kərim ləfzi və nəzmi etibarilə möcüzədir. Lakin sünnə belə deyil.

2. Quranın tilavətiylə ibadət olunur. Lakin sünnənin belə bir xüsusiyyəti yoxdur.

3. Allah Qurani-Kərimi dəyişməkdən və təhrifdən qoruma-ğı şəxsən üzərinə götürmüşdür. (Sünnənin Qurani-Kərimi bəyan etməsi cəhətilə hədisi-şəriflərin ümumi mənada qorunduğu bir həqiqətdir).

4. Quranı sünnədə olduğu kimi məna olaraq rəvayət etmək caiz deyil.

5. Dəstəmazsız Qurani-Kərimi tutmaq haramdır.

6. Qurani-Kərimin ləfzi kimi mənası da Allaha aiddir. Sünnə isə yalnız məna cəhətilə vəhydir.[33]

Bu və bənzəri fərqlərdən dolayı, fiqh üsulu, hökmlərin dəlil-lərində ilk olaraq Qurani-Kərimi, ikinci olaraq da Sünnəni əsas götürmüş və hər birini öz məzmununda qiymətləndirmişdir. İslam tarixində "Qurani-Kərim bərabərdir Sünnə" deyən heç bir alim yoxdur.

**Dördüncü iddia: "Sünnə" ilə əməl etmək şirkdir:**

Quranilər "Sünnəni həyata tamamilə hökm etməkdə təyin edici olduğunu qəbul etməyin", - "Hökm ancaq Allahındır"[34] tərcüməsindəki ayəyə zidd olduğunu və «şirk» məzmununda qiymətləndiriləcəyini iddia edirlər. Mövzu ilə əlaqədar Əhməddin bunları söyləyir: «İnsanlar şirki canlandırmaq üçün çox fərqli yol bəyan etdilər. Əsl itaət ediləcək olanın Allah-Təala olduğuna inanırıq de-

32. Buxari, Elm, 39; Əbu Davud H.No: 3646

33. Cəmaluddin əl-Qasimi, *Qavaidut-Təhdis,* s, 64.

34. Ənam, 6/57.

yirlər; lakin itaət məqamı olan Allaha itaətə bağlı olaraq Rəsuluna da tabe olmağı Allahın bizə əmr etdiyini söyləyirlər. Bu fasid dəlilə əsaslanaraq da hər növ şirki təshih edirlər.[35]

**Cavab: Tövhid binasına asılan "şirk" tablosu**

Şirki ortadan qaldırmağa məmur olan, Məkkədə ilk olaraq "Lə iləhə illəllah" deyən bir Peyğəmbərə itaət etməyi Qurani-Kərim "tövhidin gərəyi", Quranilər isə "şirkin şəxsən özü" olaraq xarakterizə edirlər. Bu gün yer üzündə Allahdan başqa ilah olmadığını söyləyən, "Muhamməd Allahın Rəsuludur" deyən müsəlmanlardır. Onlar Allah Rəsuluna ﷺ itaət etməyi də Qurani-Kərimdən öyrəndilər. Quranilərin bu ifadələri tarixin ən böyük ziddiyyətlərindən biridir. Qurana görə əməl etdiklərini iddia edənlər Quranın təlimatı ilə Allah Rəsulunun ﷺ əmrlərinə itaət etməyə "şirk" deyirlər.

Bu həqiqət ən yüngül ifadə ilə birlikdə Onun Rəsuluna itaət etməyi əmr edən ayələri inkar etməkdir: **"Bir mömin kişi və ya qadının Allah və Rəsulu hökm verdiyində artıq işlərində bundan başqasını seçmək haqları yoxdur. Allahın və Rəsulunun əmrinə üsyan edənlər doğru yoldan açıq-aşkar uzaqlaşmışlardır"**.[36] Ayədə "Allah və Rəsulu" ifadəsi keçmiş və "Rəsul" sözü "Allahın" ləfzinə "fərqlilik" ifadə edən "vav" hərfi ilə şamil edilmişdir. Buna görə Allah və Rəsulu iki ayrı mənbədir. İnsanlar hökmü birbaşa Allah-Təaladan ala bilmədiklərinə görə "Allah" ləfzindən Qurani-Kərim, Rəsul ləfzindən də "sünnə» başa düşülür.

**"Xeyr! Rəbbinə and olsun ki, onların arasında çıxan ixtilaf barəsində səni hakim edib sonra da verdiyin hökmlərə görə özlərində bir sıxıntı hiss etmədən onu qəbul etmədikcə və boyun əyib təslim olmadıqca iman gətirmiş olmazlar."**[37]

35. Əhmədudin, *Təfsiru Bəyanin-Nəs,* II, 395-495.

36. Əhzab, 33/36.

37. Nisa, 4/ 65.

Quran qadın-kişi hər mömini Peyğəmbərin hökmünə uymağa dəvət edir. Allah da zatına and içib, "Ey Peyğəmbər! Sənin verdiyin hökmə razı olmayan, qərarından ötrü narahatlıq duyan iman etmiş ola bilməz" - buyurur. Buna görə bir iddianın həllində Allah Rəsuluna ﷺ müraciət edib verdiyi hökmlə əməl etmək Quranilərin iddia etdiyi kimi şirkdir, yoxsa tövhiddir?! Hansı ki yüz ildir edilən təxribatlar nəticəsində "İman və İslam coğrafiyasına qəribləşdirilən millət, xaricilər kimi gəzir və «hidayət» deyə «dəlalətə" çağırıldığını fərqinə vara bilmir. Nə Quranı, nə də Sünnəni tanıyır. Şirk tablosunun tövhid binasına, tövhid tablosunun da şirk binasına asıldığını anlaya bilmir. Allah Rəsuluna ﷺ itaət Quranilərə görə şirk olduğu halda, Qurana görə isə tövhidin özüdür.

Qurani-Kərimin qiyamətə qədər keçərli, ayələrin də bütün zamanlarda qarşılığı olduğuna görə, yaşayarkən Allah Rəsulunun ﷺ özünə, vəfatından sonra da səhih hədislərə müraciət etmək Qurani-Kərimin əmridir. Səhih bir hədisin hökmünə razı olmaq, Allah Rəsulunun ﷺ risalətinə razı olmaqdır. Əgər Allah-Təala bütün zaman və məkanlarda Peyğəmbərimizin hakimliyinə müraciət etməmiş olsaydı, ayədəki "yuhakkimukə (səni hakim edirlər)[38] felinə "Kəful-Xitabın və "Qadaytə (hökm verdin) hərəkəsinə də Təul-Xitabın bitişməsi doğru olmaz, əksinə ayənin belə olması lazım idi. Hətta yuhakkimul Quran (Quranı hakim qoyana qədər) və mimmə Qadə fihil-Quran (Quranın verdiyi hökmdən) şəklində olardı. Məsələ aydındır. Bütünlüklə bütün insanlığın qurtuluşu Allaha və Onun Peyğəmbərinə itaət,[39] iman və ya küfrləri də itaət edib etməmələrinə bağlıdır.[40]

Sünnənin aradan qaldırılması insanlığın hidayətinə qarşı təşkil edilən bir sui-qəsdir. Qurani-Kərim daha bir çox ayədə insanları Allah və Rəsulunun hökmünə itaət etməyə dəvət edir. Bu gün aramızda olmadığına görə Peyğəmbərimizin hökmünə ancaq hədis məcmuələrinə müraciət edərək əməl edə bilərik. Əgər hədislərin

38. Nisa, 4/65.

39. Nur, 24/51.

40. Nur, 24/47.

səhih olanları uydurma olanlardan seçilməyəcək şəkildə olsa, Allah da onlara tabe olmaqla ümməti məsul tutsa və bundan ötrü də cəzalandırsaydı, şübhəsiz ki, bu, Onun ədalətinə uymazdı. Belə olduğu halda Allah Rəsuluna ﷺ itaəti əmr edən ayələr ümumi mənada Sünnənin də qorunacağının təminatıdır. Quranilərin “Hökm ancaq Allahındır”[41] ayəsiylə istidlal etmələri də doğru deyil.

Çünki Allah Rəsulu ﷺ şəxsən Allah-Təala tərəfindən Qurani-Kərimi açıqlamaqla vəzifələndirilmiş,[42] bu məqamda söylədikləri də Allah-Təala tərəfindən özünə vəhy edilmişdir.[43] Bu səbəbdən səhih hədislərin ehtiva etdiyi hökmlər Allah Rəsulu ﷺ vasitəsilə Allah-Təaladan alınmışdır. Allaha və Rəsuluna itaəti[44] əmr edən Qurani-Kərim “Rəsula itaət edən Allaha itaət etmişdir”[45] buyurur. Buna görə Qurani-Kərim və Sünnənin bütövlüyünü şirk qəbul etmək, şirkdir. Çünki Allah-Təala qullarını özündən aldıqlarını təbliğ edən Peyğəmbərimizə itaət etməyə çağırır.[46] Qurana və Sünnəyə itaətdən üz çevirənlərin isə kafir olduqlarını ifadə edir.[47] Sünnəyə əməl etməyə «şirk» demək, Allaha baxmayaraq hökm qoymaqdır ki, bu da şirkin özüdür.

**Beşinci iddia: Sünnə mənbə olmadığından hədislər yazılmadı:**

Allah Rəsulunun ﷺ yalnız Qurani-Kərimi yazdırdığını iddia edən məalçılar “Əgər Sünnə höccət olsaydı, Allah Rəsulu ﷺ onu da yazdırardı. Yazdırmamış olması Sünnənin mənbə olmadığını göstərir” - deyir.

**Cavab: Yalanlar üzərinə yazılmış nağıllar:**

41. Ənam, 6/57.
42. Nəhl, 16/44.
43. Qiyamə, 75/19.
44. Ali-İmran, 3/32.
45. Nisa, 4/80.
46. Nur, 24/56.
47. Ali-İmran, 3/32.

Qurani-Kərim **“Həqiqətən, Allahın Rəsulu Allaha, qiyamət gününə ümid bəsləyənlər (Allahdan, qiyamət günündən qorxanlar) və Allahı çox zikr edənlər üçün gözəl örnəkdir!”**[48] buyurur. Allah-Təala Sünnəyə tabe olmağı Cənnətə nail olmaq və razılığına nail olmaq yolu olaraq göstərir. Allah Rəsulunun ﷺ da “Mənim namaz qıldığımı gördüyünüz kimi siz də elə namaz qılın”[49] buyurması səhabələrin şəxsən Sünnəyə əməl etdiyinin dəlillərindən sadəcə biridir.

Səhabələr Allah Rəsulunun ﷺ Sünnəsinə dərin bir bağlılıqla tabe olmuş, hədisləri mühafizə edə bilmək üçün də uzun və yorucu səyahətlər etmişdir. Quranilərin hədislərin yazılmadığı ilə əlaqəli cümlələri, ideoloji bir fəaliyyətin qurbanı olan ifadələrdir. Çünki Mədinənin ilk illərində hədislərin Qurani-Kərimlə qarışmasından narahat olan Allah Rəsulu ﷺ bu vəziyyət ortadan qalxdığında yazılmalarına icazə vermişdir. Hökmdarlara yazılan məktublar, səhabələrin hədis səhifələri, Hudeybiyə müqaviləsinin mətni kimi xüsuslar hədislərin yazıldığı ilə əlaqəli misallardan yalnız bir neçəsidir.[50]

**Altıncı iddia: Hədislərin yerli və tarixi olduğu:**

Quranilər Allah Rəsulunun ﷺ Qurani-Kərimi o dövrdəki müsəlmanları nəzərə alaraq təfsir etdiyini, bu çıxışların Ərəbistanın sərhədlərini aşmayacağını və o dövrə aid olduğunu iddia edirlər. Bu nöqtədə belə deyirlər: “Allah Rəsuluna ﷺ itaət öz zamanı ilə məhduddur. Onun verdiyi hökmlərin tətbiqi edilməsinin sərhədləri də öz həyatından kənara çıxmaz.”[51]

Səhih hədislərə etiraz edə bilməyən Quranilər açıqca bunu deyirlər: Allah Rəsulunun ﷺ hədisləri səhabələrinin yaşadığı şərt-

48. Əhzab, 33/21.
49. Buxari, Azan, 18.
50. Xalid İstanbullu, Kamalistləri Heyran Qoyan “Müsəccəl Sünnə Düşməni”ndən Ən Yeni Orientalizm Məsəlləri, Hökm, sy. 45, s, 32.
51. Məcəllətul-Bəyan, 1951, s, 32.

lərə uyğun idi. Əgər biz də o zamanlarda yaşasaydıq, Onun Sünnəsinə tabe olmaq bizə də vacib olardı".[52]

**Cavab: Quranilərin "Dini bizdən soruşun" çıxışı**

Quranilər və tarixçilər iddia edirlər ki, hədislər Peyğəmbərin yaşadığı dövrdə lazım idi indi lazım deyil. Yerli xalq üçün idi. Bu iddianın bir nağıl olduğu göz önündədir. Çünki Quranın da, Sünnənin də qaynağı vəhydir. Əgər Sünnə tarixidirsə, Quran da tarixidir. Sünnə universaldırsa, Quran da universaldır. Quranı bəyan etmək səlahiyyəti Allah Rəsuluna ﷺ verildiyinə görə Quranın açıqlanmağa ehtiyacı vardır. Çünki Quran ancaq Allah Rəsulunun ﷺ bəyanı ilə açıq-aşkar olur və o zaman həqiqi şəkildə əməl edilə bilər. Sünnənin tarixi olduğu iddiası qəbul edilsə, bu vəziyyətdə Quranın peyğəmbər tərəfindən izah edilən xüsuslarını kim təfsir edəcək?!

Bu nöqtədə ya məalçılardan biri çıxıb "Bundan sonra din məndən soruşular" deyib peyğəmbərlik iddia edəcək, ya da "Quran anlaşılmadığından ötrü bu əsrə deyəcək sözü qalmamışdır" - deyərək tarixiçilər kimi ədavətini açıqca izhar edəcək.

Quranilərin iddia etdiyi kimi Peyğəmbər yalnız öz zamanına danışdısa, bu vəziyyətdə **"De ki, Ey İnsanlar! Mən göylərin və yerin sahibi olan Allahın hamınıza göndərdiyi elçisiyəm"**[53] ayəsini necə başa düşmək lazımdır?! Söylədikləri tarixi və yaşadığı əraziylə məhdudlaşmış bir peyğəmbər necə bütün insanlığın peyğəmbəri ola bilər?! Ayrıca Allah-Təalanın quluna məhəbbət etməsinə vəsilə olan peyğəmbərə tabe olmasının[54] bir qarşılığı olardımı?

Sünnəyə "uydurulan din", dini təhrif etməyə isə "endirilən din" deyən Quranilər ilk planda Allahın bütün insanlığa müjdəçi

52. Xalid İstanbullu, Kamalistləri heyran qoyan "Müsəccəl Sünnə Düşməni"ndən Ən Yeni Orientalizm Məsəllər, Hökm, sy.45, s 32.

53. Əraf, 7/158.

54. Ali-İmran, 3/31.

və xəbərdaredici olaraq[55] göndərdiyi Peyğəmbəri yaşadığı dövrə həbs edib, Qurani-Kərimin də həbs edilməsinin yolunu açırlar. Bir fərqlə ki tarixçilər bunu açıq şəkildə, Quranilər isə "Quranı anlamaq" örtüyü altında edirlər.

**Yeddinci iddia: İslamı müdafiə**

Quranilərin Buxari və Müslim kimi səhih hədis kitablarındakı bir neçə hədisi ekranlarda öz düşüncə dünyalarına xidmət edəcək şəkildə şərh edərək İslama qarşı edilən ən əhatəli və sarsıdıcı hücumların təməlində ağıla zidd olan bu hədislər vardır deyirlər. "Ümmətin geri qalmasının əsas səbəblərindən biri də bu hədisləri səhih qəbul edib, onları qorumaq adına sorğulayıcı ağılı öldürməkdir" kimi iddiaları irəli sürərək Sünnəni rədd edirlər.

**Cavab: Qurani-Kərimdən bəzi ayələri çıxarmağa aralanan qapı**

Səhabələr Allah Rəsulunun ﷺ həyatını bütün istiqamətləri ilə rəvayət etmişdir. İnsanlara məhrəm qalan ailə həyatı da Peyğəmbərin xanımları vasitəsilə izah edilmişdir. Əfsus ki, irəliləyən illərdə fərqli amillərlə müəyyən qruplar Peyğəmbərə baxmayaraq hədis uydurmağa başlamış, "həqiqətin içinə "xurafat" soxmağa çalışmışdır.

Əvvəl Hz. Müaviyənin tərəfdarları, daha sonra da Hz. Əlinin tərəfdarları bu iki səhabənin xəbəri olmadan hədis uydurmuşdur. Qədəriyyə, Murciə, Cəhmiyyə kimi təriqətlərin bir-birlərilə olan mübarizələrində də qarşılıqlı hədislər uydurulmuşdur. Bir tərəfdə xairicilər, mürtədlər var ikən, təəssübkeşlər də hədis olmayan şeylərə "hədis" dedi.

Mühəddislər bu uydurma fəaliyyəti qarşısında reaksiyasız qalmamışlar. Səhih hədisi zəif, ya da uydurma olandan ayıracaq əsasları təsbit etmiş, bu mövzuda əsərlər qələmə almışlar. Bu əsaslar çərçivəsində bir hədis qəbul ya da rədd edilmişdir. İsnad sistemi

55. Səbə, 34/28.

bütün bu hücumların qarşısında möhtəşəm bir qala kimi dayanmış, həqiqəti xurafatdan ayırmış, səhih hədisləri mühafizə etmişdir.[56]

Məalçıların hədis inkarına örtük tapa bilmək və özlərini də günahsız göstərə bilmək üçün "Biz Qurana zidd olduğundan və İslamı müdafiə edə bilmək üçün bu hədisləri inkar edirik" – deyirlər. İddialarına misal olaraq zikr etdikləri bir hədisi təhlil edərək məsələni konkret hala gətirək: "Əgər Bəni-İsrail olmasaydı ət iylənməzdi"[230] hədisini alimlərin fikirlərinə müraciət eləmədən anlamaq çətindir. Əfsuslar olsun ki, bu hədisi qərbli və yerli şərqşünaslar insanların zehnini bulandırmaq üçün istifadə etmişlər. Onlar bununla "Bu və bənzəri hədislər ağıla və Qurana ziddir" fikrini formalaşdırmağa çalışmışlardır.

Alimlərin fərqli şəkillərdə izah etdiyi bu hədislə əlaqəli həqiqətə ən yaxın açıqlama isə budur: "Qurani-Kərimdə buyurulduğu kimi onlara qüdrət halvası və bildirçin göndərilən[57] yəhudilər bildirçini saxlamayıb yemək ya da sədəqə kimi istifadə etməli idilər. Onlara, şəriətləri bunu əmr etsə də, xəsislik edərək əti yığdılar, bundan ötrü də ət iyləndi. O ana qədər insanlar heyvan kəsər, ov edər lakin əti saxlamaz dərhal istifadə edərdilər. İlk dəfə əti yığıb saxlamaq yəhudilər tərəfindən edildiyinə görə, ətin iylənmə hadisəsi də onlar vəsiləsilə oldu.

Quranilərin "hədislər" üzərindən İslama hücum etməsi, hədisləri inkar etmələri, ancaq onların Qurana nə qədər yad olduqlarına dəlil ola bilər. Münafiqlərin ən iffətli qadın Hz. Aişəyə iffətsiz iftirasını Qurani-Kərim bir mənada münafiqlərin vəzifəsi olaraq göstərməkdədir: **"Möminlər arasında əxlaqsızlığın yayılmasını istəyənlərə dünyada və axirətdə şiddətli bir əzab gözləyir."**[58] Dünən olduğu kimi, bu gün də kafirlərin çoxu, sanki Qurana düşmən olmaq üçün yaradıldıqlarını düşünərək, yalanlar üzərinə iftiralar inşa edirlər. Buna görə məalçılar, kafirlər hansı

56. Əkrəm Diya əl-Uməri, *Buhus fi Tarixis-Sünnətil-Müşərrəfə,* 20.

57. Bəqərə, 2/57.

58. Nur, 24/19.

ayələri tənqid edirsə, onlara şirin görünmək üçün o ayələri də Qurandanmı çıxaracaqlar?

**Səkkizinci iddia: Sünnə ümməti böldü**

Quranilər Qurani-Kərimin tək bir millət hörgüsündən bəhs etdiyini; hansı ki Sünnənin müsəlmanların firqələrə, qruplara bölünüb parçalanmasına səbəb olduğunu müdafiə edirlər. Bu nöqtədə Abdullah Çakralevi belə deməkdədir: "Müsəlmanlar Amrın, Zeydin rəvayəti kimi isnad mədəniyyətinə bağlı qaldıqları müddətcə parçalanmaqdan xilas ola bilməz, tək bayraq altında toplana bilməz, bir fikir ocağı onları bir araya gətirə bilməz."[59] Quranilər açıqca bunu deyirlər: "Peyğəmbərə itaət çərçivəsində uydurulan hədisləri ehtiva edən kitabları tərk etmədikcə müsəlmanların iki yaxası bir araya gəlməz".

**Cavab: İnsanların istəkləri qədər din icad etmək layihəsi:**

İslam Ümməti ən ağır zərbələri vəhdətdən bəhs edən dairələrdən almışdır.

Əgər iddia edildiyi kimi Sünnənin nəzərə alınmaması müsəlmanların səflərini birləşdirəcək olsaydı, Quranilər tək bədən olar, qısa zamanda bir çox təriqətə ayrılmaz, liderlərindən bir-birinə zidd fikirlər səslənməzdi. Sünnənin ümməti parçaladığını söyləyənlər bu gün bir elmihal kitabı yazmaqdan aciz olduqları kimi namazın neçə vaxt olduğu nöqtəsində belə ittifaq edə bilməmişlər. Bir qismi namazın beş, digəri dörd, üç, başqa bir qrup da iki vaxt olduğunu müdafiə edir. Təkbirlə başlayıb salamla bitən namazı lüğəvi mənasını nəql edərkən Nur Əhməd bunları deyir: «Namaz Allahdan olarsa rəhmət, məxluqatdan, mələklərdən, insanlardan və cinlərdən olsa qiyam, rüku , dua və təsbeh mənasındadır. Quranın ruhuna uyğun olan namazın mənası budur.[60] "Nur Əhmədin bu ifadəsi Sünnəni rədd edir, əsas məqsədlərini izhar edir. O məqsəd də namazın vaxtları kimi Ümmətin icma etdiyi bir xüsusda

59. Məcəllətu-İşaətil-Quran, Şaban, 1321, s, 39.

60. Muhamməd Fadıl Siyalquti, *Burhənul-Furqan,* s, 45.

belə dörd ayrı firqəyə bölünüb, «vəhdət» şüarıyla ümməti parçalamaq, insanların istəkləri qədər din icad etməkdir. Qurani-Kərimi Sünnə ilə anlayan Hənəfi, Şafei, Maliki və Hənbəlilərdən ibarət Əhli-Sünnənin yekunu isə namaz vaxtlarında ixtilaf etmək bir tərəfə, nə rükətlərində, nə də rükunun və səcdənin formasında ixtilaf etmişdir. Yalnız bu xüsus belə Sünnəni bölən deyil, birləşdirən olduğuna misal olmağa kafidir. Kilsə bunun üçün Qurani-Kərimlə Sünnə üzərindən mübarizə aparmışdır. Əgər Quranın “Namaz qılın!” buyruğunun necə başa düşülməsi lazım olduğunu Allah Rəsulu ﷺ ümmətinə göstərməsəydi, bu gün hər kəsin istəyinə görə bir “namaz” forması olacaqdı.

Kimi salatdan (namazdan) dua etməyi, kimi mücərrəd bir halda Allaha yönəlməyi anlayacaq, kimi namazı ayaqda, kimi oturaraq başlayacaq; kimi hər rükətdə bir səcdə, kimi üç səcdə edəcəkdir. Kimi fərzləri bir, kimi iki rükət qılacaqdı. Lakin Allah Azzə və Cəllə qullarına rəhmət etdi. Peyğəmbəri göndərdi O da Sünnə ilə İslamı dərin ixtilaflara düşməkdən qorudu.

**Xülasə:**

Çakraləvi Quraniliyin əsaslarını, ingilislərdən həm təlimat, həm də nişan alan Seyyid Əhməd xandan aldı. Buna görə Quranilərin bir qismi birbaşa, bir qismi də dolayı yoldan kilsəyə xidmət etməkdədir. Bizdəki Quranilərin hər nə iddiaları varsa, hamısı Hindistanda zühur edən Quraniyyun hərəkatına aiddir. Buna görə hadisəni muqəllidlər üzərindən deyil, ingilislərin AR-GEsində işləyən Çakraləvi kimi “ixtiraçılar” məzmununda təhlil etdim.

Quranilik Allah Rəsuluna ﷺ dəli deyən, insanları Ondan uzaqlaşdırmaq üçün Ona dair hər növ yalanı uydurmağı vəzifə qəbul edən, nəəşini qəbrindən çıxarmaq üçün xüsusi adamlar göndərən, lakin hər dəfə istədiyinə nail ola bilməyən kilsənin aktyorlarının müsəlmanlar arasından seçdiyi ən son və ən təhlükəli oyundur.

# SÜNNƏ DÜŞMƏNİNDƏN ƏN YENİ ŞƏRQŞÜNAS NAĞILLARI

İmam Buxaridən əvvəl Sünnəyi-Səniyyə ilə əlaqəli tərtib edilən kitabların tarixi Allah Rəsuluna ﷺ qədər gedib çıxır. Allah Rəsuluna ﷺ tələbəlik edən Abdullah b. Amrın "Səhifəsi", Zeyd b. Sabitin "Kitabul-Fərai" bunların ən əhəmiyyətlisidir. Bəzi səhabələr də özləri üçün hədis məcmuələri təlif etmişlər. Tabeun alimləri də buna bənzər işlər görüb.

Fərziyyələrə davam etsək bunu söyləmək lazımdır: Buxari iddia edildiyi kimi ərəblər tərəfindən aradan qaldırılan İran dövlətinin intiqamını almaq və İslamın yayılmasına mane olmaq üçün hədis uydurmuş olsaydı, ərəblərin yeni müsəlman olan farslar və türkləri xor sayan və ya tərifləyən hədislər uydurardı. Lakin Buxari bunun əkisni etmişdir. Çünki Buxaridəki "Kitabul-Mənaqibin ikinci babı "Mənaqibu-Qureyş / Qureyşin Mənqibəsi" haqqındadır. Buxarinin bu babda rəvayət etdiyi ilk hədis isə belədir: "Bu əmr (xilafət) Qureyşdədir. Onlar dini iqamə etdiyi müddətcə kim onlara düşməncəsinə davransa Allah onu üzü üstə yerə vurar.[61] "Buxari," əl-Camius-Səhihində Qureyşin mənqiblərinə müstəqil bir bab ayırmışdır.[62] Buxari, Qurani-Kərimin Qureyşin dili üzrə endiyini ifadə

61. Buxari, Mənəqib, 2.

62. Allah Rasulunun ﷺ Abdullah b. Rəvaha, Zeyd b. Harisə, Usamə b. Zeyd kimi Qureyşdən olmayan sahəbələri vali olaraq təyin etməsi göstərməktədir ki, Xəlifənin Qureyşdən olduğunu bildirən hədislər vaciblik yox, fəzilət bildirir.

etdiyi Kitabul-Mənaqibin üçüncü babında isə bu rəvayəti nəql edir: Hz. Osman (r.a) Qurani-Kərimi çoxaldıb Mushafı böyük vilayətlərə göndərməyə qərar verincə, Hz. Hafsanın evindəki Qurani-Kərim səhifələrini istəyir. Ənsardan Zeyd b. Sabit, Qureyşdən isə Abdullah b. Zübeyr, Səid b. əl-As və Əbdürrəhman b. əl-Harisdən ibarət dörd nəfərlik heyətə Hz. Hafsanın Mushafını əsas götürərək Qurani-Kərimi çoxaltmağı əmr edir. Qureyşdən olan üç nəfərə də, Zeyd b. Sabitlə hər hansı bir hərfin yazılışı və ya bir sözün irabında (qramatik təhlil deməkdir) ixtilaf etdiklərində onu Qureyşin ləhcəsində yazaraq ixtilafı aradan qaldırmalarını deyir. Səbəb olaraq da, Qurani-Kərimin Qureyşin ləhcəsi üzrə endiyini deyir. Onlar da buna riayət edir.[63] Buxari iddia edildiyi kimi İran imperiyası adından İslamdan intiqam alsaydı, rəvayət etdiyi hədislər, farsları tərifləyən, ərəbləri isə təhqir edən rəvayətlərdən meydana gələrdi.

## Ümmət Buxariyə qədər sünnədən xəbərsiz idi?

Sünnəyi-Səniyyə, Qurani-Kərimin vəhy edilməsi ilə başlayır. Allah Rəsulunun ﷺ Mədinədə on altı ay Məscidi-Əqsaya doğru namaz qılması, arzu etməyinə baxmayaraq üzünü Kəbəyə çevirməməsi[64] Beyti-Məqdisi öz arzusu ilə qiblə etmədiyini göstərir. Çünki əksi olsaydı, vəhy gözləməz, Kəbəyə dönərdi. Lakin dönmədi, gözlədi.

Qurani-Kərimdə Beyti-Məqdisə doğru namaz qılmağı əmr edən bir ayə olmadığına görə, müsəlmanlar Kəbəni istəmələrinə baxmayaraq Qüdsə doğru namaz qılmağa davam etmişlər. Buna görə də Allah Rəsuluna ﷺ gələn buyuruqlar "vəhyi-mətluv" adlanan Qurani-Kərim və "vəhyi-qeyri-mətluv" adlanan sünnə olaraq iki cür başa düşülməlidir. Səhabələr Allah Rəsulu ﷺ ilə birlikdə yaşayır, onun sözünə itaət edir, hərəkətlərini də nümunə götürürdülər. Sünnə sətirlərdən əvvəl yaddaşlarda mühafizə edildi. Sonra yazıya köçürüldü və səhabə də daxil olmaqla hər əsrdə bir çox

63. Buxari, Mənəqib, 3; Ayni, *Umdətul-Qari,* XVI, 109.

64. Bəqərə, 2/144.

müsəlman Allah Rəsulunun ﷺ hədislərini nəsildən nəslə ötürdü. Buxarinin dövründə və ondan əvvəl də hədis tərtib edərkən də ortada Sünnəyi-Səniyyə ilə əlaqəli çox sayda müstəqil hədis kitabı var idi. Bir qismi fiqh və təfsir kitablarında yazılmışdı. İmam Buxarinin və ondan əvvəl Sünnə ilə əlaqəli tərtib edilən bu kitabların tarixi Allah Rəsuluna ﷺ qədər uzanır. Allah Rəsuluna ﷺ tələbəlik edən Abdullah b. Əmrin "Səhifəsi", Zeyd b. Sabitin "Kitəbul-Fəraizi" bunların ən əhəmiyyətliləridir. Bəzi səhabələr də özləri üçün hədis məcmuələri təlif etmişdilər. Tabeunun da bu yolu davam etdirmişdir. Həmmam b. Münəbbih "əs-Səhifətus-Səhihəni" tərtib etmişdir. Həmmamın çap edilən məcmuəsinin əl yazması kitabxanalarda mövcuddur. İmam Muhamməddin bir hissəsini birbaşa Əbu Hənifə, bir qismini də Əbu Yusuf yolu ilə Əbu Hənifədən aldığı fiqhi məsələləri ehtiva edən "Zahirur-Rivayə" kitablarında da hədislər sənədləri ilə zikr edilməkdədir. Bu cəhətlə ilk dövr fiqh kitabları hədis elmi ilə zəngindir.

İmam Əbu Hənifə hicri 150-ci, Buxari isə 256-cı ildə vəfat etmişdir. Yəni Buxari, Əbu Hənifənin vəfatından 44 il (194) sonra dünyaya gəlmişdir. Bu tarixi həqiqətlərə baxmayaraq "Buxariyə qədər hədis yox idi" demək, günorta vaxtında günəşi inkar etmək ya da insanların gözlərilə şahidlik etdiyi bir məkanı yox saymaq kimidir.

### Buxaridən əvvəl tədvin edilən əsərlər

İmam Malik Muvattasını Buxarinin doğumundan 54 il əvvəl hicri 140-cı ildə tərtib etmişdir. Əsərinin Allah Rəsulundan ﷺ rəvayət edilən hədisi-şəriflərin az bir qismini ehtiva etməsi və onun yayılması ilə ətraf bölgələrdəki mühəddislərin tərtib etdiyi hədis məcmuələrindəki rəvayətlərin rədd edilməsinə görə, İmam Malik Muvattasının hər tərəfə göndərilib əsas kitab sayılmasına icazə verməmişdir. Bu vəziyyət də göstərir ki, İmam Buxari tələbəykən Muvattanı da, digər mühəddislərin əsərləri kimi oxumuşdur.

İmam Buxari 10 yaşında ikən vəfat edən İmam Şafei isə hədis elminə aid Müsnəd, fiqhdə əl-Umm, Usulu-fıqh və Mustaləhul-hədis sahəsində isə ər-Risalə adlı əsərə müəlliflik etmişdir.[65]

Hicri 241-ci ildə vəfat edən Əhməd bin Hənbəl, 30 min hədis ehtiva edən Müsnədini Buxarinin doğumundan on dörd il əvvəl (180) yazmağa başlamışdır. Müsnədlə əlaqəli, "Bunu, insanlar Allah Rəsulunun ﷺ Sünnəsi haqqında ixtilaf etdikdə müraciət edəcəkləri əsas kitab olaraq tərtib etdim" demişdir. Əbu Hənifə, İmam Malik, Şafei və Əhməd b. Hənbəl, Buxaridən əvvəl yaşamışdır. Buna görə Buxari bunlar içərisində yalnız Əhməd b. Hənbəldən birbaşa, digərlərindən isə tələbələri vasitəsilə hədis rəvayət edə bilmişdir.

Buxaridən əvvəl yaşamış məşhur dörd imam xaricində bir çox alimin də hədis sahəsində əsərləri var. Buxari bunlardan Abdullah b. Mübarəkin (v. 181) Sünnə ilə əlaqəli əsərini daha kiçik yaşda əzbərləmişdir. Əbu Davud ət-Tayalisi (v. 204), Müsnədi yazdığında Buxari 14 yaşında idi. Hicri 211-ci ildə vəfat edən Əbdürrəzzaq əs-Sanəni də Musənnəfi təlif etmişdir.[66]

Yuxarıda bir qismini zikr etdiyimiz əsərlər də göstərir ki, Sünnə Buxaridən çox əvvəl yazılmağa başlamışdır; hədisləri yazmaq və tərtib etmək fəslindən onları təsnif etmə mərhələsinə keçilmişdir. Buna görə "Buxari, əl-Camius-Səhih adlı əsərini yazana qədər keçən iki əsrdə Sünnə yox idi, Buxari onu özündən uydurmuşdur" demək, əsassız bir iddiadan başqa bir şey deyil.

## Hz. Əbu Bəkir hədisləri yandırıbmı?

Şərqşünaslar və müttəfiqlərinin müsəlmanların Allah Rəsulunun ﷺ hədislərinə olan etimadını azaltmaq üçün müraciət etdik-

65. Şafeinin "ər-Risaləsi" Sünnədən istifadə etməyi sistemləşdirdiyi üçün "Mustaləhul-Hədis" sahəsindəki ilk iş olaraq da qəbul edilə bilər.

66. Əbdül-Mehdi Abdul-Qadir, *Dəfuş-Şubuhat anis-Sünnətin-Nəbəviyyə,* 240-243.

ləri yollardan biri də kitablardan uydurma rəvayətləri önə çıxarıb zehinləri qarışdırmaqdır. Hz. Əbu Bəkrin Allah Rəsulundan ﷺ rəvayət edilən hədisləri Hz. Aişəyə yandırtdığı iddiasıdır.[67] Hədis inkarçıları bu iddia ilə əslində bunu söyləməkdədirlər: «Quran bizə yetər. Hədislərsə şübhəli olduqlarından onlarla əməl edilməz. Allah Rəsulunun ﷺ ən yaxını olan Hz. Əbu Bəkir (r.a) hədislərdən bu dərəcə şübhə duyur və onları yandırırsa, Peyğəmbərdən əsrlər sonra gələn müsəlmanlar o rəvayətlərə necə etimad edə bilər?! Sünnəni Hz. Əbu Bəkir (r.a), yoxsa ondan iki əsr sonra gələn Buxari daha yaxşı bilir? Hər gün Allah Rəsulu ﷺ ilə birlikdə olan Əbu Bəkirə (r.a) uyub, hədisləri məhv etmək lazım deyilmi?

Bu cür sualları ortaya ataraq müsəlmanların zehnlərini qarışdıranlar, hədis imamlarının əlaqədar rəvayətlə əlaqəli dəyərləndirmələrini gözardı edərək və ya onları nəzərə almadan nəql etməkdədirlər. Necə ki İmam Zəhəbi Hakimdən Hz. Əbu Bəkrin, Hz. Aişəyə 500 rəvayəti yandırdığı istiqamətindəki iddianı nəql edir, sonunda da, "Bu məlumat doğru deyil" yəni mövzudur (uydurmadır)[68] deyir.

İbn Kəsir də sözü gedən rəvayətin sənədində olan Əli bin Salehin məchul bir ravi olması səbəbi ilə bu rəvayətin mərdud ( qəbul edilməyən hədis) olduğunu deyir.[69]

Zəhəbinin Hakimdən nəql etdiyi bu rəvayət doğru qəbul edilsə də, hədisləri yandırmaq hadisəsi hədis inkarçılarının iddialarını təsdiq etmir. Çünki rəvayətə görə Hz. Əbu Bəkir (r.a) hədisləri ravilərə güvənmədiyindən ötrü deyil, onları özünə rəvayət edən bir ravinin doğruluğundan şübhələndiyi üçün yandırmışdır. Hz. Əbu Bəkir (r.a) özünə bu hədisləri rəvayət edən adamı səhabə olmasından ötrü Allah Rəsuluna ﷺ bilərək yalan isnad etməklə də ittiham etmir. Adını vermədiyi ravidən aldığı hədisləri yandırmasının səbəbi isə unutqanlıq, anlama problemi, qəflət, yanılma

67. (https://www.youtube.com/watch?v=gtxraQOIAYU) Dəq:02:00

68. Zəhəbi, *Təzkirətul-Huffaz,* I, 10-11.

69. Əli əl-Muttəqi, *Kənzul-Ummal,* H. No: 29446.

kimi vəziyyətlər ola bilər. Burada üzərində düşünülməsi lazım olan mühüm məsələlərdən biri də budur ki, minlərlə səhabənin Allah Rəsulundan ﷺ hədis rəvayət etməsini, onun səhabəyə, "Əbu Şah üçün (xütbəni) yazın"[70] şəklində təlimat verməsini, Abdullah b. Amrın, «Mən Allah Rəsulundan ﷺ eşitdiyim hər şeyi yazırdım ki, Qureyş məni bundan daşınmağa çağırdı və dedi ki: "Allah Rəsulu ﷺ, qəzəb və razılıq halında danışan bir bəşər olduğu halda ondan duyduğun hər şeyi yazırsanmı?" Bunun üzərinə yazmaqdan imtina etdim. Daha sonra mövzunu Allah Rəsuluna ﷺ bildirdim. Barmağı ilə ağzını işarə etdi və belə buyurdu: "Yaz! Nəfsimi qüdrət əlində tutan Allaha and olsun ki, bu ağızdan haqdan başqa bir şey çıxmaz".[71] Mədinə konstitusiyasını, Allah Rəsulunun ﷺ Hüdeybiyyə müqaviləsini yazdırmasını və səhabənin tərtib etdiyi hədis məcmulərini nəzərə almayan şəxslərin, Zəhəbinin uydurma olduğunu söylədiyi bir rəvayət üzərindən hədisləri inkara çalışması, bir yalanı əsas alaraq mütəvatir tarixi həqiqətləri inkar etmək kimidir.

**Xülasə**[72]

Bu gün Özbəkistan sərhədləri daxilində yer alan Buxarada dünyaya gələn İmam Buxarinin İranlı olduğu iddiası həm tarixi, həm də coğrafi gerçəklərə ziddir. Buxaralı bir mühəddisin süqut edən İran imperiyası üçün İslamdan intiqam almaq adına hədis uydurduğu iddiaları tamamilə ziddiyyətlərlə doludur. Əgər Buxari Farslar adından İslamla savaşsaydı, Farsın etibarını yüksəldəcək hədislər uydurar və bunları yayardı. Lakin o «əl-Cəmius-Səhihində" Xilafətin Qureyşdə olmasının daha doğru olacağı anlamına gələn hədisləri rəvayət etdi. Buxari hədisləri həm öyrənmiş, həm də həyatına tətbiq etmişdir.

Cərh və tədil elmini ən yaxşı bilənlərdən idi. Bu, onu hədis uyduranların tələsinə düşməkdən mühafizə etdi.

70. Buxari, İlim 39; Əbu Davud, H. No: 3646.

71. Buxari, Elm, 39; Əbu Davud, H. № 3646

72. Orientalistlərin istifadə etdiyi yuxarıdakı üç iddiadan ikisi İslamoğlu tərəfindən dilə gətirilməkdədir.

Buna baxmayaraq Buxarinin söz və əməlinə əks olunan təqvası onu cərh və tədildə mötədil davranmaqda qabaqcıl etdi. Bəkr b. Münir Buxarinin belə dediyini bildirir: "heç kimin qeybətini etmədən Allahın hüzurunda hesab verəcəyimi ümid edirəm". Buxari Allah Rəsulunun Sünnəsi ilə birbaşa ona tabe olmaq üçün maraqlanmışdır.

Necə ki, atıcılıq alimlərin maraq dairəsinə girmədiyi halda Buxari Sünnə olması səbəbiylə onunla da məşğul olmuşdur. Atıcılıqda məharəti o qədər gözəl idi ki, ötəri atdığı oxlar belə hədəfdən yayınmazdı.[73] İslam, İran, Xorasan və Mavəraunnəhr bölgələrinə hakim olduqda xalq öz ixtiyarları ilə İslamı seçmiş, İslam dövləti də kimsənin əlindən nə malını, nə əmlakını almışdır. Buxarinin doğulduğu şəhəri sərhədləri içərisində saxlayan Mavəraunnəhr də öz iradəsi ilə müsəlman olduğundan xalqda kin və nifrəti doğuracaq heç bir səbəb olmamışdır. Günümüzə qədər yaşayan mühəddislər onun elmi dərinliyi, əmanəti, təyin edilən elmi meyarlara sədaqəti kimi yönlərini nəzərə alaraq Buxarini hədis elmində "Əmirul-möminin" olaraq qəbul etmişlər. Fəqehlər də hədislərinə maraq göstərmişlər. Səhih rəvayətləri ehtiva etdiyindən onun kitab müctəhidlərin Qurandan sonra müraciət etdiyi kitabı olmuşdur. Onun ortadan qalxması ilə ondakı rəvayətlərə əsaslanan ictihadların da xurafat olacağını bilən «şərqşünaslar» Qurani-Kərimdən sonra ən çox ona hücum etmişlər. O, hədis tərtibində ilk deyildir. Ondan əvvəl Allah Rəsulunun ﷺ yaşadığı əsrdən başlayaraq hədisləri tərtib edən çox sayda əsər də yazılmışdır. Abdullah b. Amrın əs-Sahifətus-Sadiqası, Zeyd b. Sabitin Kitabul-Fəraizi, Həmmam b. Münəbbihin Səhifəsi, İmam Malikin Muvattası, Şafeiinin əsərləri, Əhməd b. Hənbəlin Müsnədi, Abdullah bin Mübarəkin əsərləri var idi. Belə olduğu halda kiminsə "Sünnə Buxaridən əvvəl yox idi. Buxari onu bilib görmədiyimiz qaynaqlardan təlif etdi" deməyi yaz günü günorta vaxtı günəşin varlığını inkar etməkdən fərqsizdir.

73. Əhməd Fərid, *əl-İmamul-Buxari,* 38.

# MEHDİ GƏLƏCƏKMİ?

Günün gecəsi var deyə gündüzə qarşı çıxmaq, yaşı da qurunun yanında yandırmaqdır. Hansı ki, tarixdə yaş qurunun yanında yanmışdır. Bu günlərdə, tam da bu prosesi yaşayırıq. Doğruların səhvlərlə yer dəyişdirdiyi dövrdə, xeyli vaxtdır xoca, mürşid, təkkə və mədrəsələrə qarşı mübarizə aparanlar indi "camaatlıq" adı altında fitnə qruplaşması formalaşdırmış və bütün camaatlıqlara meydan oxumağa başlamışlar. Bəziləri, Mehdilik mübahisələrini, müsəlmanların İslamdan ayrılmasına vasitə etməyə çalışırlar. Onun üzərindən daha dərinlərə enəcəklər. Üz ifadələrində, "Ey Millət! Siz nə gördünüz. Daha nələr, nələr var. Sizə din deyə xurafatı izah etmişlər." Mehdiliklə əlaqəli yazılan məqalələrin əksəriyyətində Əhməd Əminin təsiri var. Mənzərəni görüncə, «Biri səhv bir yol quruncа arxasıyla nə çox insan gedərmiş» demədən dayana bilmirsiniz. Aşağıdakı sətirlər, son bir əsrdə Əhməd Əmin xəttində Mehdilik üzərinə yazanların ortaq qənaəti: Mehdi, sosial-mədəni kontekstdə uydurulan, «rəngli və canlı bəzəklərilə bəzi macəraların, dünyəvi və siyasi əməl sahiblərinin və çarəsiz kütlələrin əlaqə mərkəzi olan[74] bir təsəlli vasitəsidir.

### "Goldziher"in təsiri və Mehdinin inkarı

İslam coğrafiyasının siyasi işğala paralel olaraq yaşadığı ideoloji mübarizə dövründə ən çox müzakirə edilən mövzulardan biri

74. Ruhi Fiğlalı, *"Məsih və Mehdi İnancı Üzərinə",* A.Ü.İ.F.D., XXV, 214.

olan Mehdiliyə şərqşünaslar daha çox maraq göstərmişlər. Bu mövzuda saf zehinləri öz əməlləri istiqamətində istiqamətləndirməyə çalışmışlar.İslam modernizminin qurucu şəxsiyyətlərindən biri olan Goldzihere görə Mehdi anlayışı yəhudilik, xristianlıq və maniheizm kimi dinlərə aid bir inanc olub, Kabul-Əxbar ilə Vəhb b. Münəbbih tərəfindən Hz. Peyğəmbərə aid rəvayətlər yolu ilə müsəlmanlar arasında yayılmışdır.[75] Saxta mehdilərin müxtəlif fəaliyyətlərini ön plana çıxaran müsəlman yazarlar da, orientalistlərin Mehdiliyin isnad mərkəzilə əlaqəli mazdeizm, atəşpərəstlik, yəhudi və xristianlıq kimi təsbitlərini təsdiqləyərlər.[76]

Əhməd Eminə görə rafizilərin "Gözlənilən Mehdisi", Əməvilərin "Süfyani" ləqəbini daşıyan qurtarıcısının olması, Abbasilərin xoşuna gəlmir və onlar da Mehdi haqqında hədislər uydurur.[77] Əhməd Sərdaroğlu da Diyanət məcmuəsində nəşr edilən "Mehdi haqqında" başlıqlı yazısında Qurani-Kərimin Mehdidən bəhs etməməsini Buxari və Müslimdə mövzu ilə əlaqəli səhih bir rəvayətin olmamasını, Mehdi anlayışının İslamda olmadığına səbəb kimi göstərir.[78]

Mehdilik anlayışının müsəlmanları İslamiyyət üçün çalışmaqdan məhrum buraxacağını da iddia edən bu qrup,[79] rəvayətlərin ağla zidd olduğunu da müdafiə etməkdədir.

## Lüğətdə Mehdi

Allah-Təala tərəfindən hidayətə çatdırılmış adam mənasında istifadə edilən Mehdi yol göstərən mənasındadır. Qurani-Kərimdə eyni kökdən bir çox söz keçməsinə baxmayaraq "Mehdi" kəlməsi

75. əl-Əqidə vəş-Şəria fil-İslam, Qahirə, 1946, 193-195.
76. Cemil Hakyemez, *Mehdi Düşüncəsinin Etiqadlaşması Üzərinə,* G.Ü.İ.F.D., 2004/1, III, sy: 5, s, 130.
77. Duhal-İslam, III, 173.
78. Ahmet Serdaroğlu, *"Mehdi Haqqında",* May-İyun, 1968, sy. 72-3, s, 127.
79. Serdaroğlu, eyni məqalə, s, 18.

keçmir. Lakin Allah Rəsulu ﷺ Hz. Əlini (r.a) hidayətə vəsilə olan və Mehdini hidayətə çatdıran"[80] sifətləriylə zikr edir, Müaviyə üçün də "Ya Rəbbi! Onu doğru yola çatdıran Hədi və çatanlardan Mehdi qıl. Onunla insanları doğru yola yönəlt!"[81] buyurmuşdur. İstilahi mənada Mehdiliklə əlaqəli bir çox rəvayət vardır.

### 30 Sahabənin rəvayəti ilə Mehdi

Mehdinin zühuru nöqtəsində alimlərin icması vardır. Buna görə axır zamanda Allah Rəsulunun ﷺ Əhli-beytindən Muhaməd b. Abdullah adında biri çıxacaq, müsəlmanlar ona tabe olacaq, İslamı və müsəlmanları zəfərə aparacaq, küfrün belini qıracaq, ədaləti hakim qılacaq.

Mövzu ilə əlaqəli hədislər mənəvi təvatür dərəcəsindədir. Suyuti bunların 40-dan çox olduğunu söyləməkdədir.[82] Allah Rəsulundan ﷺ Mehdinin zühuruyla əlaqəli hədisi rəvayət edən səhabə sayı isə 30-dan çoxdur. Bunların arasında Osman b. Affan, Əli b. Əbu Talib, Talha b. Übeydullah, Əbdürrahman b. Avf, Abdullah b. Abbas, Abdullah b. Məsud kimi səhabələr də iştirak edirlər. Əbu Davud, Tirmizi, İbn Macə, ən-Nəsai, Əhməd b. Hənbəl, İbn Hibban, Hakim, Tabərani kimi böyük hədis imamları da bu rəvayətləri əsərlərinə daxil etmişlər.

Məlum hədislərin bir qismi səhih, bir qismi həsən, bir qismi də zəifdir. "Tarix" əsərində Mehdi ilə əlaqəli rəvayətlərinin hamısının zəif olduğunu söyləyən İbn Xaldun xəta etmişdir.[83] Otuzdan çox səhabə tərəfindən nəql olunan hədisləri kitablarında yazan böyük hədis imamları və Mehdinin zühurundan bəhs edən alimlərə qarşı gələnlər Əhli-Sünnəyə qarşı hər hansı dəlil irəli sürə bilməmişlər. Məqalələrində adətən zəif hədisləri tənqid edərək mövzu ilə əlaqəli

80. Əhməd, *Müsnəd,* H. No: 817.
81. Tirmizi, H. No: 3842.
82. Suyuti, əl-Həvi, II, 213.
83. Əzim Abədi, *Avnul-Məbud,* XI, 282.

sadəcə həmin hədislərin olduğunu göstərməyə çalışmış və Mehdinin zühurunu inkar etmişlər.

## Mehdinin xüsusiyyətləri

Allah Rəsulu ﷺ Mehdinin həqiqisini saxtasından ayırd edəcək ölçüləri bu şəkildə təyin etmişdir. *"Dünyada yalnız bir gün qalsa, -Zaidə, hədisində belə dedi: Allah o günü uzadarda- (Sonra bütün ravilər ittifaq etdilər.) O gündə məndən və ya Əhli- Beytimdən, adı adıma, atasının adı da atamın adına uyğun gələn birini göndərər."*[84]

*"Yer üzü zülm və düşmənçilik dolmadan qiyamət qopmaz. Sonra mənim ailəmdən biri çıxar, yer üzünü zülm və düşmənçilik dolduğu kimi ədalətlə doldurar."*[85] *"Dünyanın ömründən yalnız bir gün qalsa, Allah mənim Əhli-beytimdən bir adam göndərəcək, o da dünyanı daha əvvəl zülmlə olduğu kimi, ədalətlə dolduracaq."*[86]

*"Mehdi mənim nəslimdəndir. O açıqalınlı və burnunun ortasındakı sümük qabarıq olacaq. Yer üzünü zülmlə dolduğu kimi ədalətlə dolduracaq və yeddi il hökm sürəcək."*[87] *"Mehdi mənim ailəmdən, Fatimənin nəslindən olacaq."*[88]

## Alimlərin Görüşü

Süfyan-Sevri, Bərbəhəri, Əhməd əl-Busti, Əbu Süleyman əl-Xattab, Beyhəqi, Əbu Bəkir b. Ərəbi, Qadı İyaz, Süheyl, İbnul-Cövzi, Qurtubi, Qastallani, Zəhəbi, Şatibi, Səxavi, Suyuti, İbn Həcər Heytəmi başda olmaqla alimlərin cümhuru da bu hədislərlə

84. Əbu Davud: H. No: 4276.
85..Əhməd, *Müsnəd,* H. No: 11331.
86. İbn Macə, Fitən, 34.
87. Əbu Davud, H. No: 4279.
88. Tirmizi, H. No: 2230.

istidlal etmiş və Mehdinin zühur edəcəyini demişlər.[89] İbn Həcər Beyhəqidən, Mehdinin zühuruyla əlaqəli hədislərin isnad cəhətiylə son dərəcə səhih olduqlarını,[90] Bərbəhəri də Şərhu-Sünnəsində, Hz. İsanın enib Dəccalı öldürəcəyi, evlənəcəyi və Allah Rəsulunun ﷺ ailəsindən birinin arxasında namaz qılacağını zikr edir.[91]

## Mehdi niyə Qurani-Kərimdə yoxdur?

Quran mücməl olaraq nazil oldu, Allah Rəsulu ﷺ da onu bəyan etdi. Allah Azzə və Cəllə möminlərə həm Qurana, həm də sünnəyə tabe olmağı əmr etdi. Haramların bir qismi ayələrdə, bir qismi də hədislə sabit oldu.

Qurani-Kərim Allah Rəsulunun ﷺ da halal və haram qılma səlahiyyətinin olduğunu bildirdi.[92] Bundan biri "vəhyi-mətluv" digəri isə "vəhyi-qeyri-i mətluv" olmaqla iki cür vəhyin olduğu aydın oldu. Çünki qiblənin Məscidi-Əqsadan Məscidi-Harama dönmə müddətində Allah Rəsulu ﷺ çox arzu etməsinə baxmayaraq[93] artıq üzünü Məscidul-Harama tərəf çevir![94] ayəsi gələnə qədər Beytullaha yönəlmədi. Əgər Məscidi-Əqsaya doğru namaz qılmaqla bağlı bir vəhy olmasaydı, Allah Rəsulu ﷺ gözləməyəcək, dönəcəkdi. Qurani-Kərimdə Məscidi-Əqsaya doğru namaz qılmaqla əlaqəli bir əmr olmadığına görə köhnə qiblə "vəhyi-qeyri mətluv" ilə sabitdir. Yenə Bəni- Nadir qəbiləsi mühasirə olunduğunda hərbi tədbir gərəyi ağaclar kəsilərkən yəhudi və münafiqlərin mənfi təbliğatı üzərinə Allah-Təala ağacların öz izni ilə kəsildiyini xəbər vermişdir.[95] Lakin Quranda belə bir icazəyə dəlalət edən bir ayə yoxdur. Bu vəziyyət də göstərməkdədir ki, Allah Rəsulu ﷺ vəhyi-mətluv

---

89. Muhamməd İsmail əl-Muqaddəm, *əl-Mehdi,* s, 67-71.
90. İbn Həcər, *Təhzibut-Təhzib,* IX, 126.
91. Şərhus-Sünnə, 73; Muhamməd İsmail, *e. a. ə.,* s, 81.
92. Əraf, 7/157.
93. Bəqərə, 2/144.
94. Bəqərə, 2/144.
95. Həşr, 59/5.

xaricində ayrı bir kanaldan da Rəbbindən vəhy almaqda idi.[96] Allaha itaət etmək olduğunu bildirən,[97] ixtilaf anında Allaha/Qurana və Rəsulullaha/sünnəyə müraciət yolunu göstərən ayələr[98] Allah Rəsulu, sizə nəyi verirsə onu alın və sizə nəyi qadağan etmişdirsə ondan da uzaq durun.[99] məzmununda qiymətləndirildiyində Mehdinin də dolayı yoldan Quranda iştirak etdiyi aydın olur. Çünki Qurani-Kərim Peyğəmbərin sözlərinə itaət etməyi əmr etməkdədir. Mehdinin zühuru da Allah Rəsulunun ﷺ bu məzmunda zikr etdiyi həqiqətlərdəndir. Buna görə Allah Rəsulundan ﷺ səhih olaraq rəvayət edilən hər hədisi təsdiq etmək, Qurani-Kərimə tabe olmaq kimidir. Mehdinin zühuruyla əlaqəli səhih hədislər də Quranın özünə tabe olunmasını əmr etdiyi Peyğəmbərdən varid olmuşdur.

Təbəri, məscidlərdə Allahın adını zikr etməyə mane olan və onların xarab olması üçün səy göstərənlərin aqibətini bildirən, “Onlar üçün dünyada rüsvayçılıq, Axirətdə də böyük bir əzab vardır”[100] ayəsini təfsir edərkən dünyadakı rüsvayçılığı Mehdinin zühuru olaraq şərh etməkdədir.[101]

### Niyə Buxari Mehdidən bəhs etmir

Mehdinin zühurunu inkar edənlərin istinad nöqtələrindən biri də Buxaridə mövzu ilə əlaqəli bir rəvayətin olmamasıdır. Buxarini gözdən salmaq üçün əlindən gələni edənlərin bu iddiasını bir tərəfə buraxaraq bunu söyləyək: Bununla ən səhih iki hədis məcmuəsi Buxari və Müslimin müəllifləri Mehdi hədislərini əsərlərinə almadıqlarına görə hədislər uydurmadır düşüncəsini yaymağa çalışırlar.

96. Ali-İmran, 3/132.
97. Nisa, 4/80.
98. Nisa, 4/59.
99. Həşr, 59/7.
100. Bəqərə, 2/114.
101. Təbəri, *Camiul-Bəyan fi Təfsiril-Qurən,* I, 548.

Bu bilinməlidir ki, Buxari əzbərində 300 min hədis olduğunu bunlardan 100 mininin səhih, 200 minin də səhih olmadığını deyir.[102]

Buxari də isə təkrarlarla birlikdə 7275 hədis vardır. Göründüyü kimi Buxari səhih hədislərin rəqəmini 100 min olaraq verərkən kitabına aldığı hədis sayı olduqca azdır. Buxari və Müslim bir çox mühüm məsələdə hədis rəvayət etməməsinə baxmayaraq üləma, digər hədis məcmuələrindəki rəvayətlər səhih isə onlarla fitva vermiş və əməl etmişdir. On səhabənin cənnətlik olduğunu bildirən hədislər Sünən kitablarıyla Əhməd b. Hənbəlin Müsnədində də var. Buna baxmayaraq ümmət onlarla əməl etmiş, əqaid kitablarında aşərəi-mübəşşərə zikr edilmişdir.

Əvvəlcə bilinməlidir ki, Mehdi mövzusu Buxaridə mücməl, digər hədis məcmuələrində isə müfəssəl olaraq vardır. Necə ki Buxari və Müslimin rəvayət etdiyi hədisi-şərifdə Allah Rəsulu ﷺ, "Məryəm oğlu İsa aranıza endiyində və imamınız da sizdən olduğu halda halınız necə olur?" buyurmaqdadır.

### İbn Macə hədisi

İbn Macənin rəvayət etdiyi, "Məryəm oğlu İsadan başqa Mehdi yoxdur"[103] hədisi də Mehdinin zühuru ilə əlaqəli rəvayətlərlə ziddiyyət təşkil etmir.

Hər şeydən əvvəl ziddiyyət eyni səviyyədəki rəvayətlər arasında olur. Bir tərəfdə Mehdinin zühuru ilə əlaqəli mütəvatir hədislər, digər tərəfdə isə İbn Macənin Kutubu-Sittə müəllifləri arasında rəvayətində tək qaldığı hədis. Hakim də Müstədrəkdə olan həmin rəvayəti nəql etdikdən sonra "Bu hədisi Müstədrəkdə onunla istidlal etmək üçün deyil, heyrətimi bildirmək üçün zikr etdim"[104] deyir.

---

102. İbn Həcər, *Hədyus-Sari, Muqaddimətu Fəthil-Bəri,* s, 512.

103. İbn Macə, H. No: 4039, Hədisin isnadında həddindən artıq zəiflik var. Zəhəbi hədisin münkər olduğunu demişdir. Mizanul-İtidal, III, 535.

104. Hakim, *əl-Müstədrək,* s, 488.

Fərz edək, bu hədis səhih qəbul edilsə belə mənası kamillik ifadə edir.

“Fatihəsiz namaz olmaz”. Ya da “məscidə qonşu olanın namazı ancaq məsciddə olar” hədisləri “Namaz fatihəsiz kamil olmaz” və ya məscidə qonşu olanın namazı ancaq məsciddə kamil olur formasında aydın olduğu kimi, “Kamil Mehdi” də yalnız İsa bin Məryəmdir şəklində anlaşılmalıdır. Necə ki, İmam Qurtubi də hədisdən hərəkətlə “kamil və günahsız olan Mehdi” İsa b. Məryəmdir şəklində başa düşülməlidir, deyir.[105]

## Nəticə

Mehdiliklə əlaqəli rəvayətlər Tövrata, məcusilərə deyil, Allah Rəsuluna ﷺ əsaslanır. 30-dan çox səhabə tərəfindən mənəvi təvatür yolu ilə nəql edilmişdir.

Mehdinin zühurunun Quranda açıq olaraq olmaması onun inkarına dəlil olmaz. Çünki Qurani-Kərim[106] Allah Rəsulundan ﷺ gələn hər şeyi almağı və ona itaət etməyi əmr etməkdədir. Mehdiliklə əlaqəli rəvayətlər də Quranın özünə tabeliyi əmr etdiyi Peyğəmbərə əsaslanır.

105. Qurtubi, *ət-Təzkirə fi Ahvəlil-Məvta,* 723.

106. Həşr, 59/7.

# QƏRBİN AĞIL OCAĞINDA BUXARLANAN HƏQİQƏT: NÜZULU-İSA

## (Hz. İsanın nüzulu)

Bir gün dünyanın da sonu çatacaq. İçindəkilərlə birlikdə dünya da yox olacaq. Bu sonsuz tükənişin nə zaman olacağını bilmirik.

Allah Rəsulu ﷺ risaləti müddətində qiyamətin vaxtı ilə əlaqəli suallarla tez-tez qarşılaşırdı. Quran hadisəni belə izah edir: **“(Ya Rəsulum!) Səndən saat (qiyamət günü) haqqında soruşarlar ki, nə vaxt qopacaq? De: “O ancaq Rəbbimə məlumdur”**.[107]

Qiyamətin mütləq olaraq bilinməzliyində zehinlərə işlənmək üçün Dihyətul-Kəlbi surətində Nəbinin yanına gələn Cəbrayıl, Allah Rəsulundan ﷺ qiyamətin vaxtını soruşduqda O, belə cavab vermişdi: “Soruşulan soruşandan daha yaxşı bilmir”.[108] Buna görə qiyamət “Muğəyyəbatı-Xamsə”dən (beş bilinməyən şey) sayıldı. Bunların bilinməsi ilə əlaqəli qapı tamamilə bağlanıb. Quran və Sünnənin tələbi də bu istiqamətdədir.

Hz. İsanın bədəni ilə səmaya qaldırıldığı, qiyamət ərəfəsində isə təkrar yer üzünə enəcəyi adı çəkilən əlamətlər içərsindədir və

107. Əraf, 7/187.

108. Müslim İman, 8; Tirmizi, İman, 2738; Əbu Davud, Sünnə, 4695.

dəlillər ilə sabitdir. Dəccal, Yəcuc və Məcuc, Dabbətul-Ərz, günəşin qərbdən doğması və Hz. İsanın yer üzünə enişi də dəlillərlə sabitdir.[109] Necə ki Əllamə Muhamməd Ənvər Şah əl-Kəşmiri, "ət-Təsrih bimə təvatərə fi Nüzulil-Məsih" adıyla qələmə aldığı əsərində Nüzul həqiqətini cəm etdiyi hadisələrin etiraza imkan verməyəcək şəkildə isbat etməkdədir.

Muhamməd Zahid Kövsərinin Hz. İsanın öldüyünü, yer üzünə enəcəyini iddia edən Şeyx Mahmud Şəltutun fitvasına yazdığı rəddiyəsində adı çəkilən əsəri təsbit və təsdiq edir.[110] Hz. İsanın enəcəyinə dəlalət edən açıq ayələr və mütəvatir hədislər mövcuddur və bu haqda icma var. Buna baxmayaraq Qərb düşüncəsindən təsirlənən XIX əsrdən sonra yaşayan bir çox insan Hz. İsanın enişi ilə əlaqəli qəti hökmə etiraz etdilər. Əslində həmin əsrə qədər nüzul məsələsi insanlar üçün bir problem təşkil etmirdi. Problem nüzuldan sonra Hz. İsanın nə edəcəyi ilə əlaqəli idi. Onlara görə Hz. İsa yeni bir şəriətlə gələcəyi təqdirdə Rəsulullahın son Peyğəmbər olmasını rədd etdikdə, müsəlmanların reaksiyasını yoxlayacaqdılar. Hz. İsanın endikdən sonra Allah Rəsuluna ﷺ tabe olacağını bildirdikdə isə xristian aləmini qarşılarına alacaqdılar. "İbrahimi Dinlər" və onların tərəfdarları insanları xristianlarla paralelel düşünməyə vadar etdi. Buna görə, qələmə aldıqları təfsirdə əhli-kitabın cənnətə girəcəyini iddia etdilər, Rəsullar arasında dərəcə fərqi olduğunu rədd etdilər. Lakin Hz. İsanın enişi mövzusunda əhli-kitabla eyni qənaəti paylaşmadılar. Çünki nüzul edəcək İsanın İslam şəriətinə tabe olması xristianlığın tamamilə nəsx edilməsi mənasını verməkdə idi. Yəni bu ixtilaf onların məşruiyyətinə xələl gətirməmək üçün idi.

## İsanın həyatı

Hz. İsanın göyə yüksəldilməsi və təkrar yer üzünə dönməsi bəhsinin nə ifadə etdiyini, Sünnə və Camaat alimlərinin mənimsə-

---

109. Səid Ramazan əl-Buti, *Kubral-Yəqiniyyətil-Kəvniyyə,* s. 318.

110. Muhamməd Zahid Kəvsəri, Nəzrətun Abirə fi Məzaimi mən Yunkiru.

diyi görüşün Quran və Sünnənin açıq bəyanı olduğunu dərindən anlaya bilmək üçün Hz. İsanın həyatını bilmək lazımdır. Çünki Hz. İsanın anası Məryəmdən etibarən yaşadığı həyat onun nüzulunun da qavranmasını asanlaşdıracaq.

İmranın həyat yoldaşı saleh bir qadın idi, qarnındakı övladını Allaha həsr etmişdi. Razılığına uyğun surətdə qəbul etməsi üçün də dua edərdi. Uşaq qız olaraq dünyaya gəldikdə İmranın həyat yoldaşı kədərləndi. Nə edəcəyini bilməyərək belə dedi: **"Ey Rəbbim mənim qızım oldu".**[111] Düşünürdü ki, Allahın evinə xidmət və ibadət şərəfi yalnız kişilərə aiddir. Qızlar bunu edə bilməzlər. Xüsusilə də heyzli günlərində. Allah-Təala, saleh qadının övladına, onun şərəfinə görə ad qoydu. Onu Məryəm adlandırdı. Məryəmi saleh ananın əhdi olaraq kişinin yerinə qəbul etdi. Onu gözəlcə tərbiyə etdi. Məryəmin xalasının əri Hz. Zəkəriyyəni ona baxmaqla vəzifələndirdi. Məryəm faydalı elmi, saleh əməli Peyğəmbərdən öyrənərək yetişdi.[112] Hz. Zəkəriyyə Məryəmin yanında qışda yay, yayda da qış meyvələrinin olduğuna şahid olurdu. Uca Allah Qurani-Kərimdə buyurur: **"Belə olduqda, Rəbbi (Məryəmi) yaxşı qəbul etdi, onu gözəl bir fidan kimi böyütdü və Zəkəriyyaya tapşırdı. Zəkəriyya hər dəfə (Məryəmin) ibadət etdiyi mehraba girdikdə, onun yanında bir ruzi olduğunu görərdi. (Zəkəriyya:) "Ya Məryəm, bunlar sənin üçün haradandır?" - dedikdə, o: "Allah tərəfindəndir!" - deyə cavab verərdi. Həqiqətən, Allah istədiyi şəxsə hədsiz ruzi verər!".**[113] Haqqın divanında duran, rüku, səcdə edən Məryəm Allah-Təalanın bərəkəti ilə dünya qadınlarından üstün qılındı. Sonra dünyada da, axirətdə də etibarlı və Allaha çox yaxın olan bir oğulla İsa Məsih ilə müjdələndi. Mələk müjdəni gətirdikdə (Məryəm) dedi: **"Ey Rəbbim! Mənə bir insan toxunmadığı bir halda necə övladım ola bilər? "(Allah) dedi: "Allah beləcə istədiyini yaradır. O, bir işin olmasını istədikdə ona ancaq**

111. Ali-İmran, 3/36.

112. İbn Kəsir, *Muxtasaru Təfsiri İbn Kəsir,* (İxtisar edən. Muhamməd Əli Sabuni), I, s, 279.

113. Ali-İmran, 3/37.

**Ol! deyir, o da olur".**[114] Onun əmri o dərəcə müzakirəsiz və təxirə salınmazdır ki, Quranın ifadəsi ilə, Biz bircə dəfə əmr edirik, o da bir göz qırpımında yerinə yetir.[115]

## Ən iffətli qadına ən iffətsiz isnad

Bakirə Məryəm insanların ayıblamasından çəkindiyi üçün hamiləlik dövrünü qövmündən uzaq bölgələrdə keçirdi. Uca Allah bu mövzu barəsində Qurani-Kərimdə belə buyurur: "Doğuş sancısı onu bir xurma ağacının gövdəsinə söykənməyə məcbur etdi. (Məryəm uşaq anadan olandan sonra atası bilinmədiyi üçün cahil insanların dedi-qodusuna səbəb olacağından əndişəyə düşüb) dedi: **"Kaş ki, mən bundan əvvəl ölüb qurtaraydım və ya tamamilə unudulub getmiş olaydım!"**[116] **(Məryəm) uşağı götürüb öz adamlarının yanına gəldi. Onlar dedilər: "Ey Məryəm! Sən çox əcaib bir şeylə (atasız uşaqla) gəldin! (Və ya çox çirkin bir iş gördün!).**[117] "Məryəm bu barədə onlarla danışmağı artıq hesab etdi. Uşağına işarə etməklə kifayətləndi. Qundaqdakı bir uşağın danışmayacaqlarına inanan xalq bu halıyla Məryəmin özləriylə lağ etdiyini düşündülər: (Məryəm) ona işarə etdi. Onlar dedilər: **"Beşikdə olan körpə ilə necə danışaq?"**.[118] Qundaqda anasının sinəsindən süd əmən İsa qövmünün sayıqlamalarını eşidəndə südü tərk etdi, işarə barmağını qaldıraraq (Körpə) (dil açıb) dedi: **"Həqiqətən də, mən Allahın quluyam!".**[119] Qundaqdakı uşağın ilk nitqi Allaha qul olduğunu etiraf etmək oldu. Onun çıxışı anasını zinadan, Allah-Təalanı da şirk iddiasından tənzih etdi. O bu bəyanı ilə göyə yüksəldilməsindən sonra öz haqqında ifrata çıxan xristianları da rədd edirdi.[120]

---

114. Ali-İmran, 3/47.
115. Qamər, 54/50.
116. Məryəm, 19/23.
117. Məryəm, 19/27.
118. Məryəm, 19/29.
119. Məryəm, 19/30.
120. Qurtubi, XI, s, 69.

Pak ananın uşağı nə üçün yaradıldığını, vəzifəsinin nə olduğunu ifadə edərkən də belə demişdi: **"O (Allah) mənə Kitabı (İncili) verdi və məni peyğəmbər etdi".**[121]

İman edənlərlə inkar edənlərin haqqında ixtilaf etdiyi Hz. İsa budur. Yəni Allahın qulu və Nəbisidir.[122] İsa Məsih ancaq Məryəmin oğludur ayəsi isə bütün qapıları bağlayır.

### İfrat və təfrit arasındakı həqiqət: İsa qul və rəsuldur

Anasının qucağında həqiqəti söyləyən İsa İsrail oğullarını heyrətə saldı. Nə deyəcəklərini, nə cavab verəcəklərini bilmədilər. Fərqli fikirlər irəli sürdülər. Təriqətlərə bölündülər. Yəhudilərin çoxu İsa, "vələdi-zinadır" dedi.[123] Xristianlar da ixtilafa düşdülər: Kimi "ilahdır" kimi "üç tanrının üçüncüsüdür" iddiasını irəli sürdü. Muvahhid isə, "İsa Allahın qulu və Rəsuludur" deyərək həqiqəti doğru anlayan tək camaat oldu.[124] Hz. İsaya "vələdi-zina" deyən yəhudilər və ilahlıq isnad edən xristianlar həddi aşdılar. Həqiqət budur ki, bu mövzuda ifrat da təfrit də səhvdir və küfrdür.[125]

### Dəvətə həsr edilən ömür

Hz. İsa yaradılış qayəsini yerinə yetirərək dövrünün şahidlərinə Allahın əmrlərini təbliğ etdi. Qövmünü Allah-Təalaya ibadətə dəvət etdi. **(İsa dedi:) "Həqiqətən, Allah həm mənim Rəbbim, həm də sizin Rəbbinizdir. Elə isə yalnız Ona ibadət**

121. Məryəm, 19/30.

122. İbn Kəsir, *Muxtasaru Təfsiri İbn Kəsir,* (İxtisar edən. Muhamməd Əli Sabuni), II, s, 451.

123. İbn Kəsir, *Muxtasaru Təfsiri İbn Kəsir,* (İxtisar edən. Muhamməd Əli Sabuni), II, s, 451.

124. Muhamməd b. Muslihiddin Mustafa əl-Kocəvi, *Həşiyətu Muhyiddin Şeyxzadə alə Təfsiril-Qadı əl-Beydavi,* V, s, 550.

125. Qurtubi, VI, s, 16.

**edin! Düz yol da budur"**[126] dedi. Hz. İsaya tabe olanlar hidayətə çatdı. Müxalifət edənlər isə dəlalətə batdı.[127] Hz. İsa ömrünü Allah-Təalanın birliyini izah etməyə həsr etdi. İnsanları yalnız ona ibadət etməyə çağırdı. Onun xaricindəki hər şeyin məxluq olduğunu, buna görə onlara ibadət etməyin şirk məzmununda qiymətləndiriləcəyini dedi: **"Şübhəsiz ki, Allah Məryəm oğlu Məsihdir" deyənlər artıq kafir oldular. Məsih isə demişdir: "Ey İsrail oğulları! Rəbbim və Rəbbiniz olan Allaha ibadət edin! Həqiqətən də, Allaha şərik qoşan kimsəyə, Allah Cənnəti haram etmiş və onun sığınacağı yer oddur. Zalımlara kömək edən olmayacaqdır".**[128] Hz. İsa dəvət tapşırığını yerinə yetirərkən abid bir qul olmağı düşünürdü. Özü ilə İsrail oğulları arasında heç bir fərq görmürdü.[129] Çünki onlar kimi İsa da bir qul idi. Qulun Allah-Təalaya ibadət etməsindən daha təbii bir şey ola bilməzdi.

İsrail oğullarının inkar tufanına qarşı Allah-Təala Hz. İsanı möcüzələrlə təsdiq etdi. Allahın izni ilə palçıqdan quşa bənzər bir surət meydana gətirdi, ona üfürdü və şəkil quş surətində canlandı. Doğuşdan kor və alaca xəstəsini yaxşılaşdırdı. Ölülərə həyat bəxş etdi. İsrail oğulları bu açıq-aşkar möcüzələr qarşısında iman etmək bir yana onu sehrbaz adlandırdılar.[130] Hz. İsa İsrailin oğullarının son peyğəmbəri olaraq insanlığın son Peyğəmbəri Hz. Muhamməd ﷺ gələcəyini də müjdələdi. Bir zaman Məryəm oğlu İsa demişdi: **"Ey İsrail oğulları! Həqiqətən, mən Allahın sizə göndərdiyi, məndən əvvəl (nazil edilmiş) Tövratı təsdiqləyən və məndən sonra gələcək Əhməd adlı elçisi ilə (sizi) müjdələyən bir elçisiyəm!" (Allahın elçisi) onlara açıq-aydın**

126. Məryəm, 19/36.

127. İbn Kəsir, *Muxtasaru Təfsiri İbn Kəsir,* (İxtisar edən. Muhamməd Əli Sabuni), II, s, 451.

128. Maidə, 5/72.

129. Zəməxşəri, *əl-Kəşşaf an Haqaiqit-Tənzil və Uyunil-Əqavil,* I, s, 634.

130. Muhamməd Əli Sabuni, *Safvətut-Təfasir,* I, s, 373.

**dəlillər gətirdikdə onlar: "Bu, aşkar bir sehrdir!"** dedilər.[131] Bütün peyğəmbərlər Allah-Təalaya həmd edirlər. Lakin Hz. İsa, yaxud Hz. Muhamməd "Rəbbinə ən çox həmd edəndir.[132] Buna görə peyğəmbərlər ehramının zirvəsində o vardı. İsa da onu xəbər verir, bir mənada dünyanı onun gəlişinə hazırlayırdı.

İsrail oğulları Hz. İsanın bütün möcüzələrini sehr adlandırdılar. Onu öldürməyə belə təşəbbüs etdilər. Lakin Allah-Təala Hz. İsanı yəhudilərin hücumundan qorudu.[133] Onu öldürə bilmədilər. Ona bənzədilən bir nəfəri İsa zənn edərək çarmıxa çəkdilər. Uca Allah Hz. İsanı göyə qaldırdı.[134] Qiyamət ərəfəsində Hz. İsa təkrar yer üzünə gələcək. Bu dəfəki gəlişində peyğəmbər olaraq gəlməyəcək.

Gələcəyini müjdələdiyi Muhammədin dinini təbliğ edəcək. Bu gəlişi ilə həm də yəhudilərin "öldürdük" yalanını təkzib, xristianların ilahlıq isnadlarını rədd edəcək. Peyğəmbərlər təbliğ vəzifəsini yerinə yetirərkən bir çox çətinliklərlə qarşılaşıblar. Onları dəli, sehrbaz, kahin adlandırıblar. Böhtanlara məruz qalıblar. Əzab görüb, daşlanıb, qırmanclanıblar. Hz. İsa da çətinliklərə məruz qaldı. Nəticədə o da dünyadan ayrıldı. Lakin Hz. İsanın ayrılması, gəlişi kimi möcüzəvi oldu. Bütün peyğəmbərlər ölümü dadıb, ruhları ilə səmaya yüksələrkən o olduğu kimi səmaya qaldırıldı. İndi məqalənin əsl mövzusuna, yəni Hz. İsanın yer üzündən ayrılışı, sonra da təkrar dönüşü ilə əlaqəli ayələrin tarix boyu alimlər tərəfindən necə izah edildiyinə baxaq: Hz. İsanın yer üzündən ayrılışını ifadə edən "təvəffa" sözü "vəfa" məsdərindən törəyən "təfəul" babındadır. Sözü yerinə yetirmək[135], ehtiyacı qarşılamaq kimi mənalara gələn bu söz, əsas etibarilə "bir şeyi tam etmək" deməkdir. Bir malı və ya başqa bir şeyi tamamilə almağa da "təvəffa" deyi-

---

131. Saff, 61/6.

132. Əhməd və Muhamməd adlarının detalları üçün baxın. Qurtubi, XVIII, s, 55.

133. Maidə, 5/110.

134. Nisa, 4/157-158.

135. Məcduddin Muhamməd b. Yəqub Firuzabadi, *əl-Qamusul-Muhid,* IV, s, 462.

lir.[136] Zəməxşərinin «Əsasul-bəlağa» da bəyan etdiyi kimi «təvəffa» sözü daha sonra məcazi olaraq «öldürmək» mənasında da istifadə edilmişdir.[137] "Təvəffa" sözü Qurani-Kərimdə Hz. İsa ilə əlaqədar "mutəvəffikə" və "təvəffəytəni"[138] şəklində iki ayrı yerdə istifadə edilmişdir. İndi bu sözləri təfsirçilərin necə anladığına nəzər salaq.

Alimlərin əksəriyyətinə görə ayələrdəki "təvəffa" sözü, təslim almaq mənasındadır. Çünki "təvəffa" sözünün əsl mənası bir şeyi tamamilə almaq deməkdir. Buna görə təvəffanın məcazi "ölüm" mənasında işlədildiyini iddia etmək doğru deyil. Çünki burada məcazi mənanın alınmasına dair bir dəlil mövcud deyil. Necə ki Qurtubiyə görə Allah-Təala, Hz. İsanı yatırmadan və öldürmədən göyə yüksəltmişdir. Səhih olan da budur. Təbəri də bu fikri seçmişdir. Abdullah b. Abbasdan rəvayət edilən ən səhih görüş də bu şəkildədir.[139]

İbn Cərir, «təvəffa» sözünün təfsiri ilə əlaqəli «yatırtmaq», «ölmədən bədəniylə geri almaq» və «canını almaq» şəklindəki rəvayətləri verdikdən sonra belə deyir: «Bu mənaların ən doğrusu; «Səni yer üzündən alacaq və qatıma qaldıracağam» şəklində verilən mənadır. İbn Cərir bu mənanı mənimsəməsinə səbəb olaraq Hz. İsanın nüzulu ilə əlaqəli hədislərin mütəvatirliyini göstərir.[140]

Əbu Həyyan; «Həsən Bəsri, Dahhaq, İbn Zeyd, İbn Cüreyc və Muhamməd b. Cəfər b. Zübeyrin də bu qənaəti paylaşdıqlarını» bəyan edir.[141] Mutəaxxirunun öndərlərindən Əllamə Alusi, seçimə

136. Əbul-Fədl Cəməluddin Muhamməd İbn Mənzur, *Lisənul-Ərəb,* Darul Kutubil-İlmiyyə, XV, s, 400.

137. Zəməxşəri, *Əsasul-Bəlağa,* Darul-Fikr, s, 684.

138. Ali-İmran, 3/55; Maidə, 5/117.

139. Qurtubi, IV, s, 65.

140. Kövsəri, *Nəzratun Əbirə fi Məzaimi mən Yunkiru Nuzulə İsa Qabləl-Əxirə,* s, 98.

141. Muhamməd b. Yusuf Əbu Həyyan, *əl-Bəhrul-Muhit,* II, s, 497.

layiq olan təfsirin Hz. İsanın ölmədən və yatmadan göyə qaldırılmış olmasıdır[142] tərzindəki təfsir olduğunu deyir.

### Rabi bin Ənəsə görə

Rəbi b. Ənəsə görə "təvəffa" sözü "yuxu" halında ikən alınma mənasındadır.[143] Necə ki, Uca Allah **"Gecələr sizi yatızdıran, gündüzlər isə nələr etdiyinizi bilən Odur"**[144] buyurmaqdadır.

İbn Abbas da, yuxuda ikən ruhlar alınır deyir.[145] Buna görə ayədəki "yətəvəffəkum" sözü "yunimukum (sizi yatırır) mənasındadır. Çünki ölüm yuxunun qardaşıdır. Necə ki, Allah Rəsuluna ﷺ "Cənnətdə yuxu var mı?" deyə soruşulduqda; "Xeyr! Yuxu ölümün qardaşıdır. Cənnət isə, ölümün olmadığı yerdir", - buyurdu.[146]

"İnni mutəvəffəkə" ifadəsi "səni yatırdacağam" yəni bu halda səmaya tərəf qaldıracağam şəklində olsa yuxuda ikən göyə çıxarılan Hz. İsa, qorxu bilməz və oyandıqda özünü səmada təhlükəsizlikdə tapardı. Necə ki Rəbi ibn Ənəs də Hz. İsanın bu halda yer üzündən alınmasını Allah-Təlanın ona olan şəfqətinə bağlayır".[147]

"Təvəffa" sözü necə təfsir edilirsə edilsin, ondan sonra gələn "və rafiukə iləyyə (səni qatıma qaldıracağam) qeydi ilə fiziki bir yüksəliş olduğu aydın olur. Çünki adı çəkilən ifadə üsulcuların diliylə "nəssdir". Yəni şəxsən fiziki yüksəlişi ifadə etmək üçün işlədilmişdir.

Çünki «rafiukədən sonra gələn «ilə» artiklı sözün «adamın məqam və mövqeyini yüksəltmək» kimi məcazi mənalarını ol-

---

142. Əbul-Fədl Şihəbuddin Mahmud Alusi, *Ruhul-Məani,* III, s, 179.

143. Qurtubi, *e. a. ə.,* IV, s, 65; Əbu Həyyan, *e. a. ə.,* II, s, 497; İbn Kəsir, *e. a. ə.,* I, s, 286; Alusi, *e. a. ə.,* III, s, 179.

144. Ənam, 6/60.

145. Sabuni, *e. a. ə.,* I, s, 395.

146. Qurtubi, *e. a. ə.,* IV, s, 65; Alusi, *e. a. ə.,* III, s, 179.

147. Alusi, *e. a. ə.,* III, s, 179.

madığını bildirir. Eynilə «qanadlarıyla uçan» ifadəsindəki «qanad» sözünün «uçan» varlığın məcazən bu hərəkəti işlədiyini anlamağa mane olması kimidir.[148] "Təvəffa" sözünün "yatırtmaq" şəklində başa düşülməsi də Hz. İsanın göyə çıxarılışını təsdiq etməkdədir.

"Təvəffa" sözünün "yatırtmaq" şəklində başa düşülməsi də Hz. İsanın göyə çıxarılışını təsdiq etməkdədir. Necə ki "təvəffa" sözünü bu şəkildə təfsir edən Rəbi səmaya yüksəlmənin ruh və bədənlə olduğunu qəbul edir.[149]

## Vəhb bin Munəbbihin təfsiri

Vəhb b. Munəbbih, "mutəvəffikə" sözünün "ölüm (məvt) ruhun bədəndən ayrılması" mənasında olduğunu deyir. Bu görüşə görə; Allah-Təala Hz. İsanı dünyada ikən öldürdü sonra üç saat qədər yerdə buraxdı və bu halda yüksəldib səmada diriltdi.[150]

Alusi, Vəhb b. Munəbbihə aid bu təfsiri verdikdən sonra seçimə layiq olanın Hz. İsanın ölmədən göyə yüksəldildiyini izah edən görüş olduğunu bəyan edir. Çünki bir çox mənaya gələn "təvəffa" sözünü məcazi (ölüm) mənada istifadə etmək üçün dəlil tələb olunur. Belə bir dəlil isə yoxdur. Əksi haqqında dəlillər mövcuddur. Bu vəziyyətdə Vəhb b. Munəbbihin təfsiri keçərli deyil. Onsuz da Zahid Kövsəri, Vəhb b. Münəbbihin bu görüşü əhli-kitabdan nəql etdiyini bəyan edir.[151]

Necə ki Zəhəbi, Vəhbdən "İsrailiyyat" məlumatının çox olduğunu nəql etmişdir.[152] Bu səbəbdəndir ki; Buxari və Müslim sənədində Vəhbin olduğu yalnız bir hədisi əsərlərinə almışlardır.[153] Bü-

148. Kövsəri, *e. a. ə.,* s, 96.

149. Alusi, *e. a. ə.,* III, s, 179.

150. Əbu Həyyan, *e. a. ə.,* II, s, 497; Alusi, *e. a. ə.,* III, s, 179.

151. Kövsəri, *e. a. ə.,* s, 131.

152. İmam Zəhəbi, *Siyəru Aləmin-Nubələ,* IV, s, 545.

153. İmam Zəhəbi, *e. a. ə.,* IV, s, 556.

tün bu mülahizələr Vəhb b. Munəbbihin görüşünün nə üçün «şaz» olduğunu göstərməyə kafidir.

Vəhb b. Munəbbihin görüşü seçim edilsə belə bu, Hz. İsanın nüzuluna müxalif olmaz. Çünki Vəhb, Hz. İsanın səmada diri olduğuna və yenidən yer üzünə gələcəyinə inanır.

**Yaxın dövr təfsirçilərinə görə**

Hz. İsanın öldüyü üçün təkrar yer üzünə gəlməyinin mümkün olmadığını müdafiə edən görüş, yaxın dövr təfsirçilərinə aiddir. Necə ki Muhammad Abduh və tələbəsi Rəşid Rza «Təvəffa" sözündən ilk ağla gələn mənanın Hz. İsanın Allah-Təala tərəfindən öldürülüb mənən yüksəldilməsi olduğunu söyləməkdədir.[154]

Adı çəkilən iki şəxsin anlayış üsulunu mənimsəyən Mahmud Şəltut da hocalarını təsbit edən bir fitva vermişdir. Şəltut fitvasında Hz. İsanın öldüyünü yer üzünə təkrar gəlməyəcəyini müdafiə edir.[155]

"Təvəffa" sözü əvvəl "bir şeyi tam olaraq almaq" mənasında işlədilirdi. Necə ki Rəşid Rza da "Təvəffa" sözünü təfsir edərkən bunu etiraf edir. Lakin sonra niyəsə "təvəffadan" ağla ilk gələn mənanın ölüm olduğu iddiasını irəli sürür.

Modernist təfsirçilərin sözü gedən kəlməni "ölüm" olaraq təfsir etmələri sözün bu gün qazandığı mənasına görədir. Sözün bu gün "ölüm" mənasında işlənməsi, Quranın endiyi dövrdə səhabələrin danışıq dilində də eyni mənanın olması demək deyil. Əgər "təvəffa" sözünə müasir təfsirçilər kimi "ölüm" mənası verilsə o zaman "Allahu yətəvəffəl-ənfusə hinə məvtihə"; (Allah ölənlərin canını ölüm anında, ölməyənlərin canını isə onlar yuxuda ikən) (təvəffa)[156] ayəsindəki "öldükləri sırada" (hinə məvtihə) ifadəsi

154. Muhamməd Rəşid Rıza, *Təfsirul-Quranil-Hakim,* III, s, 261.

155. Kövsəri, *e. a. ə.,* (Şəltətun fitvası üçün baxın. s, 23-31), s, 29-30.

156. Zumər, 39/42.

səhv olardı. Allah-Təalanın kəlamı isə səhvdən uzaqdır. Yuxarıdakı ayədə Allah-Təala yatanın da, ölənin də ruhunu aldığını ifadə edərkən "təvəffa" felindən istifadə edir.

Halbuki yatan ölməməkdə, əcəli gələnə qədər yaşamaqdadır. Buna görə, "təvəffa" sözünün ağla ilk gələn mənası ölümdür demək doğru olmaz. Ayrıca Qurani-Kərimin doğru anlamağın yolu, nazil olduğu dövrün ünsiyyət dilini nəzərə almaqdan keçir.[157] Bu günün danışıq dilini istinad qəbul edib ayələri təfsir etmək olmaz.

Hadisənin necə ciddi səhvlərə səbəb olduğunu daha yaxından görə bilmək üçün belə bir nümunə verə bilərik: "Bu gün tələbənin diplom ala bilmək üçün universitetə verdiyi orijinal araşdırmaya "risalət" deyilməkdədir. Bu yoldan hərəkətlə Kitab və Sünnədə varid olan "risalətə də "xüsusi araşdırma" mənası verilsə, Allah-Təaladan gələn "vəhy" və "risalət" ləğv edilmiş olar. Bunun üçündür ki; dildəki inkişafları Quranın mənalarını inkişaf etdirməyə tətbiq etmək Allahın ayələrini bilə-bilə təhrif etmək olar.[158]

## Hz. İsanın səmaya yüksəldilməsi (Raf)

"Raf" "Bir şeyi yuxarı qaldırmaq", "dərəcə etibarilə ucaltmaq", "qaldırmaq" kimi mənalara gəlir.[159] "Raf" sözü həm həqiqi, həm də məcaz mənada Qurani-Kərimdə çox yerdə mövcuddur: Necə ki bəzən yerdəki cisimləri qaldırmaq mənasında; **"O zaman Biz sizinlə əhd bağlayıb dağı (başınızın) üstünə qaldırdıq (rafənə)".**[160] Bəzən bir binanı uzatmaq mənasında; «İbrahim İsmail ilə birlikdə Beytin (Kəbənin) bünövrəsini ucaltdıqları (yərfəu)". Bəzən adamın adını ucaltmaq mənasında; "Biz sənin adını ucalt-

157. Kövsəri, *e. a. ə.,* s, 99-100.

158. Kövsəri, *e. a. ə.,* s, 100.

159. İbn Mənzur, VIII, s, 129-131.

160. Bəqərə, 2/93.

madıqmı?" (rafənə)?[161] Bəzən status etibarilə üstün etmək mənasında istifadə edilmişdir.

"Raf'" sözü Qurani-Kərimdə Hz. İsa ilə əlaqəli iki yerdə istifadə olunur: **"Ey İsa mən sənin həyatına son qoyub Özümə tərəf qaldıracağam** (və rafiukə iləyyə).[162] Onlar onu öldürdüklərinə yəqinliklə əmin deyillər. Əksinə, Allah onu Özünə tərəf qaldırmışdır (rafəahullahu iləyhi).[163]

"Təvəffani" təfsirçilərin əksəriyyəti həqiqi mənada istifadə edərkən, raf sözünü isə mutəqaddimunun hamısı həqiqi mənada təfsir etmişdir. Buna görə Hz. İsanın dərəcəsi deyil, şəxsən özü yüksəldilmişdir. Bu girişdən sonra Hz. İsa ilə əlaqədar olan «raf» sözünün nə üçün həqiqi mənada aydın olduğunu və müasir təfsirçilərin əks bəyanatının mötəbər olmadığını izaha çalışaq:

Rafın yerdən səmaya doğru reallaşan hissi (maddi) bir yüksəlmə olduğunu ifadə edən Əbu Həyyan fikrini iki böyük təfsirçinin nəqli ilə təsdiq edir: "İbn Abbas, Hz. İsanın səmaya yüksəldildiyini, orada mələklərlə birlikdə Allah-Təalanı təsbih etdiyini, Dəccal ortaya çıxınca da Beyti-Məqdisdəki daşın üzərinə enəcəyini deyir. Zəccac "Hz. İsanın, divarında deşik olan bir evdə olduğu sırada, onu öldürmək üçün bir adamın evə girdiyini, bu əsnada Peyğəmbərin bədəniylə birlikdə səmaya yüksəldildiyini, öldürməyə təşəbbüs edən adamın da çölə İsaya bənzədilmiş bir halda çıxdığını və İsanın içəridə olmadığını gözləyənlərə xəbər verdiyini, daha sonra o xəbər verənin İsrail oğulları tərəfindən öldürüldüyünü" nəql edir.[164] Qurtubi, Allah-Təalanın İsanı ölüm və yuxu olmadan səmaya yüksəltdiyini, İbni Abbas, Təbəri, Həsən Bəsri və İbn Zeydin də bu fikirdə olduğunu bildirir.[165]

161. İnşirah, 94/4.
162. Ali-İmran, 3/55.
163. Nisa, 4/157-158.
164. Əbu Həyyan, *e. a. ə.*, II, s, 497.
165. Qurtubi, *e. a. ə.*, IV, s, 65.

Razi, Hz. İsanın Allah-Təaladan qeyri kimsənin hökmünün etibarlı olmadığı bir yerə yüksəldildiyini, yüksəltmənin isə hissi olaraq reallaşdığını deyir. Ali-İmran: 55; Nisa: 156-157-də bunun açıq bir şəkildə ifadə edildiyini vurğulayır.[166] Zəməxşəri[167] və Beydavi[168] başda olmaqla dirayət təfsirinin digər nüfuzlu simaları da Hz. İsanın ölmədən səmaya, yəni mələklərin yanına yüksəldildiyini bəyan edirlər.

## Rəşid Rzanın Görüşü İbn Abbasa istinad edirmi?

Rəşid Rza Hz. İsanın öldüyünü, necə ki İbn Abbasın da Ali-İmran surəsi 55-ci ayətdə "inni mütəvəffikə" sözünü "inni mumitukə" (səni öldürəcəyəm) şəklində təfsir etdiyini deyir.[169] Əvvəldən də nəql edildiyi kimi İbn Abbasdan rəvayət edilən səhih görüşə görə, həmin ayənin təfsiri, Hz. İsanın ölmədən göyə yüksəldildiyi şəklindədir. Rəşid Rzanın istinad etdiyi rəvayətin sənədində isə boşluq var. Çünki bu rəvayət, İbn Abbasdan İbn Əbi Talha, Müaviyə əl-Hadrami, Abdullah b. Saleh yoluyla gəlməkdədir. İbn Cərir başda olmaqla digər müəlliflərə görə, İbn Əbi Talha İbn Abbası görməyib. Yəni rəvayətin sənədində qopuqluq var.[170] Hz. İsanın öldüyü səbəbindən ayələrdə keçən "raf" hadisəsinin mənəvi bir yüksəlmə olduğunu iddia edən Rəşid Rza və tərəfdarlarının əsasda problemi möcüzəni qəbul etməməsilə əlaqəlidir. Necə ki "raf" və "nüzulu" rədd anlayışının memarı Muhamməd Abduh müasir dünyanın düşüncəsinə uyğun gəlmir deyə "Fil əshabını" yox edən quşların həqiqətdə ağcaqanad olduqlarını, bu ağcaqanadların ayaqlarına bulaşan palçıqlara yerləşdirilmiş halda daşıdıqları mikroblarla

166. Fəxruddin Muhamməd b. Ömər Razi, *ət-Təfsirul-Kəbir,* XI, s, 81.

167. Muhamməd b. Ömər Zəməxşəri, *əl-Kəşşəf,* I, s, 432.

168. Nəsruddin Əbu Said b. Ömər Beydavi, *Ənvərut-Tənzil və Əsrarut-Təvil,* (Şeyxzadə haşiyəsi ilə birlikdə), III, s, 447.

169. Rəşid Rıza, *e. a. ə.,* VI, s, 17.

170. Kəvsəri, *Məqalət,* s, 259.

Əbrəhənin ordusunu tələf etdiklərini iddia edir.[171] Abduh bu çıxışıyla Quranın bildirdiyi həqiqəti inkar edir. İngilislərin dəstəyi ilə Misirdə başladılan dini əqliləşdirmə prosesinin yeni Əzhərlilərə təlqin edilən ən əhəmiyyətli xüsus dini qeybi həqiqətlərdən qurtarmaq idi.[172] Hz. İsanın "raf '" və "nüzulu" da qeybi həqiqətlərdən olduğundan digərləri kimi rədd edildi.

## "Raf" kəlməsinin təhlili

İndi Hz. İsanın mənən yüksəldiyini iddia edən modernist ilahiyyatçıların görüşlərinin nə üçün qəbul edilə bilməz olduğunu təhlil edək:

"Həqiqətən, Allah onu qatına yüksəltdi (bəl rafəahullahu iləyhi)" ayəsi "raf'" hadisəsinin hissi (maddi) olduğunu açıqca izah etməkdədir. Ayədəki "ilə" hərfi cərri məkan və zaman üçün işlədildikdə "intiha (çatmaq)" mənasını verir.[173]

Buna görə Hz. İsanın bədəninin bir yerə çatması lazımdır ki, ora da Allah-Təaladan qeyri kimsənin qənaət sahibi ola bilmədiyi mələklər aləmidir. Bu mənanın ortaya çıxması üçün xarici bir dəlilə ehtiyac yoxdur. Çünki "raf" 'bir şeyi aşağıdan yuxarıya doğru nəqletmə şəklində reallaşır.

Ayədə, həqiqi mənadan saxlayacaq bir əlamət olmadığından, "raf" sözü məcazi mənəvi yüksəltmə mənasına aid edilə bilməz. Bu vəziyyətdə məcaz məna dəlil nəticəsində ortaya çıxan bir ehtimal olmaz.[174] Çünki ayədə məcaz məna ehtimalını rədd edən bir çox ünsür vardır:

"Həqiqətən, Allah onu qatına yüksəltdi." ayəsinin əvvəli Hz. İsaya bənzəyən adamın öldürüldüyünü bəyan edərək yəhudilərin

171. Muhamməd Abduh, *Təfsiru Cuzi Amma,* s, 120.

172. Buti, *e. a. ə.,* s, 226.

173. Mustafa b. Həmzə b. Adalı, *Nətaicul-Əfkər,* s, 41.

174. Kövsəri, *e. a. ə.,* s, 93.

Hz. İsanı öldürdükləri iddiasının əsassız olduğunu bildirir. Çünki ayənin zahiri Allah-Təalanın Nəbisini, yəhudilərdən gizləmək surətilə səmaya yüksəltdiyini, bu səbəbdən düşmənlərinin onu öldürüb asa bilmədiklərini ifadə etməkdədir.

"Onu nə öldürdülər, nə də çarmıxa çəkdilər" ayəsindən sonra gələn "Həqiqətən Allah-Təala onu qatına yüksəltdi (rafaəhu)" ifadəsindən İsanın (ə.s) canlı olaraq səmaya qaldırılması yox, Şeyx Mahmud Şəltutun iddia etdiyi kimi ruhunun yüksəldilməsi başa düşüləcəksə, o zaman hər hansı bir adamın "Quran qəti surətdə İsanın (ə.s) öldürüldüyü, sonra da asıldığı iddiasını rədd etmir" deməsi mümkün olar. Çünki ruhu ilə yüksəldilməsi, düşmənləri tərəfindən öldürülüb, sonra da asıldığını ortadan qaldırmaz. Bu vəziyyətdə Quranın "Onu nə öldürdülər, nə asdılar" ifadəsi - əstəğfirullah - zarafat kimi olar.[175] Hz. İsanın (ə.s.) canı alındıqdan sonra ölümdən xilas edilməsi Allaha acizlik aid etməkdir. Çünki yəhudilər də onun öldürülməsini istəyirdilər. Bu, eynilə qatil tərəfindən qətiliklə öldürüləcəyinə inanan adamın, qətl ediləcəyi əsnada ölümüm öz əlimdən olsun deyib intihar etməsinə bənzəyir. Həqiqət budur ki, Allah-Təala bəşərə aid acizlik hallarından münəzzəhdir. "Raf" kəlməsini məcazi mənada Hz. İsanın dərəcəsinin və ya ruhunun yüksəldilməsi olaraq izah etmək doğru deyildir.

Çünki Hz. İsa daxil bütün peyğəmbərlərin Allah-Təala qatındakı dərəcələri onsuz da yüksəldilmişdir. Bu barədə nəinki məlumat sahibi birinin, hətta sıravi xalqın belə şübhəsi yoxdur. İstər qətl edilsin, istərsə də normal bir ölümlə canı alınsın, öldükdən sonra bütün möminlərin ruhları səmaya yüksəldilir. Bu vəziyyətdə ruhun yüksəldilməsini Hz. İsaya həvalə etməyin nə faydası ola bilər?! Bir çox peyğəmbər Hz. İsadan daha çox əzab-əziyyətə məruz qalmışdır. Allah onların dərəcələrini yüksəltdiyini bildirmədən dünyadan köçmüşlər.

175. Mustafa Sabri, *Məvkiful Aqli vəl-İlmi vəl-Aləm min Rəbbil-Aləmin və İbədihil-Mursəlin,* Beyrut, 1981, IV, s, 182.

Çünki peyğəmbərlərin ruhlarının yüksəldiləcəyi hər kəsə məlum olan bir həqiqətdir.[176]

Uca Allah qurtarmağı murad etdiyi rəsullarını fərqli üsullarla mühafizə etmişdir. "Raf" kəlməsi isə bir qurtarma tərzi olaraq yalnız Hz. İsa üçün işlədilmişdir. Bu səbəbdən Hz. İsanın yüksəldilməyini mənəvi yüksəliş olaraq anlamaq doğru deyil. Çünki bütün peyğəmbərlər mənəvi yüksəlmədə ortaqdırlar. Yəni hamısının məqamı mənəvi cəhətdən yüksəkdir. "Raf" məsələsini ruhun yüksəldilməsi şəklində anlamaq da doğru deyil. Çünki bu bütün möminlərə şamildir.

Dərəcənin və ruhun yüksəlməsi yəhudilərin öldürmə təşəbbüsündən bir qurtarma da ola bilməyəcəyinə görə, Hz. İsanın həqiqətən yüksəldildiyi aşkardır. Allah-Təala onu bu yolla xilas etmişdir, eynilə o biri peyğəmbərləri fərqli yollarla qurtardığı kimi.[177] Nüzuli İsa məsələsinə etiraz edənlərin irəli sürdüyü bir xüsus da Hz. İsanın diri olaraq qaldırıldığı səmada həyatını necə davam etdirdiyi sualıdır. Halbuki bir müsəlman, məsələn şəhidlərin ölü olmadığını bilir. Bu halda, madam ki, həyatın təbəqələri var, elə isə Hz. İsanın bu dünyada yaşanan həyatdan səmaya "raf" edilmək surətiylə mələklərin yaşadığı həyata intiqal etdirildiyini söyləməkdə bir xəta olmamalıdır. "Raf" ilə əlaqədar ayələrin dəlalət cəhətdən qəti olmalarından ötrü cumhur Hz. İsanın bədəni ilə birlikdə yer üzündən yüksəldildiyi haqqında icma etmişdir.

### Nüzul

Hz. İsanın qiyamət ərəfəsində təkrar yer üzünə enəcəyi Qurani-Kərimdə açıq şəkildə bəyan edilmişdir. Bu xüsusdakı hədisi-şəriflər təvatür dərəcəsinə çatmamış olsaydılar belə, yenə də ayələr nüzul həqiqətini tək başına isbata malik olardı. Hz. İsanın nüzulundan bəhs edən ayələr bunlardır: **"Kitab əhlindən elə kimsə**

---

176. Əs-Siddiq Həsəni, *Əqidətu Əhlil-İslam fi Nüzuli İsa,* Beyrut, 1986, s, 39.

177. Həsəni, *e. a. ə.,* s, 39.

**yoxdur ki, (öz ölümündən, yaxud İsanın) ölümündən əvvəl ona iman gətirməsin. Qiyamət günü isə (İsa) onların əleyhinə şahid olacaqdır”**.[178]

**Həqiqətən, (İsanın yer üzünə enməsi) Saatın (yaxınlaşmasının) əlamətidir. (Qiyamətə) şəkk etməyin və Mənə tabe olun. Budur, düz yol!**.[179] **“Allah ona (İsaya) yazmağı, hikməti, Tövratı və İncili öyrədəcək”**.[180] Nüzulu xəbər verən ikinci ayəyə[181] görə Hz. İsa ölmədən əvvəl əhli-kitab ona “Allahın qulu və elçisi olaraq” iman edəcək. Beləcə fərqli dinlər birləşərək İslam bayrağı altında toplanacaq. Sözügedən ayədəki “bihi/ona” və “qablə məvtihi/ölümündən əvvəl” ifadələrindəki “hu/o” artiklı yuxarıdakı məna xaricində təfsirə manedir.

Belə ki, Əbu Hüreyrə, İbn Abbas, Qatədə, Həsən Bəsri, İbn Zeyd, Əbu Zeyd, Əbu Malik də ayəni belə anlamışdır.[182] Buna görə ayəni, əhli-kitabdan birinin ölmədən əvvəl, Hz. İsaya iman etməsi şəklində anlamaq doğru deyil. Çünki ayələrin yəhudilərin Hz. İsanı öldürüb asdıqları istiqamətindəki iddialarını çürütməkdədir.[183] Nisa surəsinin 155-ci ayəsindən etibarən özündən bəhs edilən adam Hz. İsadır. Ayələr ona və anasına edilən isnadlardan onların uzaq olduqlarını izah etməkdədir. Buna görə bütün əvəzliklər Hz. İsaya dönməkdədir. Burada da fərqli mənaya yozulacaq bir ünsür yoxdur. Necə ki, Quranın nazil olduğu dil olan ərəb dilinin ustadı, böyük təfsirçi Əbu Həyyan da əvəzliklərin Hz. İsaya aid olduğunu, yəni mənanın yuxarıdakı kimi olduğunu ifadə etməkdədir.[184]

---

178. Nisa, 4/159.
179. Zuxruf, 43/61.
180. Ali-İmran, 3/48.
181. Nisa, 4/159.
182. Həsəni, *e. a. ə.*, s, 42.
183. İbn Kəsir, *e. a. ə.*, s, I, s, 458.
184. Əbu Həyyan, *e. a. ə.*, III, s, 408.

İbn Kəsir yuxarıdakı mənanı dəstəkləyən hədislərin mütəvatir olduqlarını nəql edir. Əbu Hüreyrənin rəvayət etdiyi Buxari və Müslimin də kitablarına aldıqları bir hədisi-şərifdə Əbu Hüreyrə Hz. İsanın nüzuldan sonra edəcəyi şeyləri sayır, sonra da əvəzliklərin Hz. İsanı nəzərdə tutduğunu ifadə mahiyyətində sözügedən ayəni oxuyur.[185]

Əhli-kitabın Hz. İsaya iman edəcəyini ifadə edən "ləyuminənnə" felinin başında "cavabı and içərək "lam",[186] sonunda da təkid "nun"u var. Bunlar, feili gələcək zamana həvalə edirlər. Buna görə "ləyuminənnə"nin mənası: «Gələcəkdə müəyyən bir zamanda var olacaq bütün əhli kitabın Hz. İsaya iman edəcəklər» şəklində olur. Ayənin davamındakı «qablə məvtihi» qeydi də gələcək zamanı işarət etməkdədir.[187] Ayədən aşkar olduğuna görə Əhli-kitabın hamısı Hz. İsaya iman edəcək. Bu da hələ reallaşmamışdır. O halda nüzul sonrası yaşanacaq zaman, bu Quran həqiqətinin inkişaf dövrəsi olacaq.

Bütün dəlillər əvəzliklərin Hz. İsaya döndüyünü, yəni Məsihin nüzulunu isbat edir. Buna müqabil "qablə məvtihi / ölümündən əvvəl" ifadəsindəki əvəzliyin "kitabiyə" işarə etdiyini göstərən bir dəlil yoxdur. Necə ki səhih bir rəvayətin olduğu yerdə qeyri-səhih bir rəvayətə iltifat edilməz. Hz. İsanın gələcəyini xəbər verən üçüncü ayəyə[188] görə nüzul, qiyamətin yaxınlaşdığını bildirən bir əlamət olacaqdır.[189]

Çünki ayədəki (və innəhu) "hu" əvəzliyi Hz. İsaya dönməkdədir. İbn Abbas, Mücahid, Qatadə, Həsən Bəsri, Suddi, Dahhaq və İbn Zeydə görə ayənin təfsiri bu şəkildədir; "Hz. İsanın ortaya çıxması qiyamətin yaxınlaşdığına dəlalət edən bir əlamətdir. Çünki

185. İbn Kəsir, *e. a. ə.,* s, I, s, 458.
186. Əbu Həyyan, *e. a. ə.,* III, s, 408.
187. Kövsəri, *e. a. ə.,* s, 103.
188. Zuxruf, 43/61.
189. Zuxruf, 43/61.

nüzul qiyamət əlamətlərindəndir".[190] Hz. İsanın yer üzündəki ilk həyatına gəlincə bu, qiyamət əlaməti olaraq bildirilmir. Çünki ondan sonra Allah Rəsulu ﷺ gəlmişdir. Buna görə Hz. İsanın nüzulunun əlamət olaraq qəbul edilməsi doğru təfsirdir. Ayənin öldükdən sonra dirilməyi rədd edən Məkkəli müşriklər səbəbiylə mənanı; "Hz. İsanın atasız dünyaya gəlməsi Qiyamətin - sadəcə - imkanına dəlildir,[191] - şəklində anlamaq da doğru deyil. Çünki məkkəli müşriklər Hz. İsanın atasız dünyaya gəldiyini, xəstələri yaxşılaşdırdığını, - Allahın inayətiylə - ölüləri diriltdiyini qəbul etmirdilər. Bütün bu dəlillər işarə etməkdədir ki, müşriklər Hz. İsaya inanmamışlar. Bu vəziyyətdə necə olur da qəbul etmədikləri bir peyğəmbərlə onlara qarşı dəlil gətirilir.[192] Abdullah b. Abbas, Əbu Hüreyrə, Əbu Malik əl-Ğifari, Zeyd b. Əli, Qatədə, Mücahid, Dahhak, Malik b. Dinar, Əməş, Kəlbi və İbn Atiyyə "lə ilmu" şəklində şöhrət tapan sözü "ayn" hərfinin fəthəsiylə "lə aləmu / əlamət" şəklində oxumuşlar.[193] Bu oxuyuşa görə Hz. İsa, qiyamət əlamətidir. İbn Abbasın rəvayət etdiyinə görə, Allah Rəsulu ﷺ da "və innəhu lə aləmu lis-saa" ayəsini; "Hz. İsanın qiyamətdən əvvəl enməsi "şəklində təfsir etmişdir.[194]

### İsa Qurana görə hökm edəcək

Hz. İsanın enəcəyinə işarə edən bir başqa dəlil Ali-İmran surəsinin**in 48-ci ayəsidir. Mələklər Məryəmə xitab olaraq belə deyirlər:** "Allah ona (İsaya) yazmağı, hikməti, Tövratı və İncili öyrədəcək". Ayədə zikr edilən "kitab" ilə əlaqəli təfsirçilər fərqli izahlar etmişlər. Sözün məsdər mənasını alanlar ona, "əllə yazmaq" mənası vermişlərdir.[195] «Əl-Kitab» sözünün başındakı «əl» artikılını»

190. Əbu Həyyan, *e. a. ə.,* VIII, s, 26.
191. Mahmud Şəltut, *Mənəqaşə,* ("Nəzra Abirə" ilə birlikdə), s, 43-44.
192. Kövsəri, *Nəzra Abirə,* s, 104.
193. Əbu Həyyan, *e. a. ə.,*VIII, s, 26.
194. Kövsəri, *e. a. ə.,* s, 104.
195. Qurtubi, *e. a. ə.,* IV, s, 60; Əbu Həyyan, *e. a. ə.,* II, s, 484; Alusi, *e.*

«cins» üçün olduğunu deyənlər isə bu sözdə məqsədin Tövrat və İncil xaricində vəhy edilən digər kitablar olduğunu ifadə etmişlərdir.[196] Qurani-Kərimə baxıldığı zaman, "kitab" sözü Tövrat və İncil ilə bərabər istifadə edilməsinə baxmayaraq, kitab sözü Qurani-Kərim mənasını verir. Necə ki Ali-İmran 3-cü ayədəki "Kitab" sözü Quranı ifadə etməkdədir. Mələklər Hz. Məryəmə, oğlu İsaya İncilin öyrədiləcəyini bildirdikləri vaxtda İncil hələ nazil olmamışdı. Lakin əvvəlki nəbi[197] və alimlər qatında endiriləcəyi bilinməkdə idi. Lövhi-məhfuzda var olan Qurani-Kərimin də endiriləcəyi əhlinə məlumdur. Hz. İsanın peyğəmbərliyi əsnasında Quran hələ nazil olmadığına, İsaya da öyrədiləcəyinə baxılsa, bu deyilə bilər: Hz. İsa qiyamət ərəfəsində enəcək və özünə öyrədilən Qurani-Kərimlə əməl edəcək. Necə ki nüzulu xəbər verən hədisi-şəriflər Hz. İsanın İslami hökmlərlə əməl edəcəyini bildirməkdədirlər.[198]

## Nüzul ilə əlaqədar hədislər

Mövzu ilə əlaqəli az qala bütün hədis kitablarında bir, ya da daha çox rəvayət var. Hədisi şəriflərdə Hz. İsanın necə və hara enəcəyi, hansı xüsusiyyətləri vəsiləsiylə tanınacağı, nələr edəcəyi kimi sualların cavabları vardır. Cumhura görə bu hədislər "Hz. İsanın nüzulunun " bildirmələri nöqtəsində mütəvatirdir. Necə ki hər qurşaq və məşrəbdən bir çox alim açıq olaraq bu hədislərin mütəvatir olduqlarını ifadə etmişdir. Bunlar arasında önə çıxanlar bunlardır: Təbəri, Əbu Hüseyn Aburi, İbn Rüşd, İbn Atiyyə, Qurtubi, Əbu Həyyan, İbn Kəsir, İbn Həcər, Şövqani, Siddiq b. Həsən Kinnəvci, Kəttani, Kəşmiri,[199] Muhamməd Zahid Kövsəri,[200] Muhamməd Siddiq əl-Ğumari, Əbdülfəttah Əbu Ğuddə.

---

*a. ə.,* III, s, 166.

196. Əbu Həyyan, *e. a. ə.,* II, s, 484; Alusi, *e. a. ə.,* III, s, 166.

197. Əbu Həyyan, *e. a. ə.,* II, s, 484.

198. Suyuti, *Kitabul-İlam bi Hükmi İsa ə.s,* (əl-Həvi içində), II, s, 277.

199. Həsəni, *e. a. ə.,* s, 13-6.

200. Kövsəri, *e. a. ə.,* s, 104.

İsanın nüzulu məsələsi mütəvatirdir. Bundan əlavə Hz. Peyğəmbərin birbaşa xəbər verdiyi və inanılması lazım gələn (zərurəti-diniyyəyə aid) məsələlərdəndir. Bu mövzunu rədd etmək qəbulolunmazdır. Çünki, təvatür yolu ilə sabit olan hər hansı bir hökmün inkarı, Rəsulullahı da inkar etmək mənasını verir.

Muhamməd Abduh, Rəşid Rza, Mahmud Şəltut kimi modernizm anlayışına sahib olanlar mütəvatir hədislərin gücünü yəqinən bildiklərindən hədislərin mütəvatir olduqlarını rədd etmişlər. Beləcə məsələni etiqadi sahənin xaricinə daşımaq istəmişlər. Abduh və onun davamçıları hədislərin əhəd xəbər olduqlarını, bu cür rəvayətlərin sayca çox olmalarının təvatür üçün heç bir məna ifadə etməyəcəklərini iddia etmələri də bilgi xətalarıyla doludur. Necə ola bilər ki, səhabə qurşağından otuza qədər səhabənin rəvayət etdiyi bir məsələ əhəd ola bilər?! Quran və Sünnənin ədalətlərini açıqca bəyan etdiyi səhabələrdən otuza qədər səhabənin Hz. İsanın nüzulu haqda ittifaq etmələri, onların zehnindəki yalan ehtimalını dəf edə bilmirsə, deməli ortada başqa və daha əhəmiyyətli bir problem var.

## İcma

Əbu Hayyan «Hz. İsa diridir, axir zamanda yer üzünə enəcək» şəklindəki mütəvatir hədislərin üzərinə alimlərin icma etdiyini nəql edir.[201] Məlumdur ki, icma, ictihad dərəcəsinə çatan alimlərin şəri bir xüsus barədə fikir birliyi içərisində olmaları deməkdir.[202] Buna görə əməl və etiqad cəhətiylə istiqamət üzrə olmayan bidət və fisq sahibi bir alimin icmaya zidd fikir bəyan etməsi icmanın ləğvinə mane deyildir.[203] Çünki bidət əhli olan kəs insanlar üzərinə şahid (nümunə) olmaq[204] missiyasını itirir. Bu vəziyyətdə ondan gələn

201. Əbu Həyyan, *e. a. ə.,* II, s, 497.

202. Kövsəri, *e. a. ə.,* s, 135.

203. Əbdüləziz Əhməd Buxari, *Kəşful-Əsrar an Usuli Fəhril-İslam əl-Bəzdəvi,* Beyrut, 1991, III, s, 440.

204. Bəqərə, 2/143.

ixtilafın mövcudluğu bir məna ifadə etmir. Hz. İsanın (ə.s.) yer üzünə təkrar enməsi barəsində ibarət icmaya yalnız mötəzilə və cəhmiyyənin bir qismi müxalifət etmişdir. Hz. İsanın enişinə əhli-bidət firqələrdən belə çox müxalifət olmamışdır. Bütün bunlar icma dəlilinin bu bəhsdə nə qədər qüvvətli olduğunu göstərir.

**Xülasə**

Ayələr açıqca Hz. İsanın ölmədən səmaya yüksəldildiyi və qiyamətin əvvəlində təkrar yer üzünə enəcəyini bəyan edir. Hədisi-şəriflər də mənəvi təvatür dərəcəsindədir. “Raf” və “nüzulun” həqiqət olduğunu deyən cumhur, ayə və hədislərə əsaslanırlar. Lakin eyni şey “Raf” və “nüzulu” rədd edənlər üçün deyilə bilməz.

Çünki nüzulun olmayacağını ehtiva edən tək bir ayə ya da hədisin varlığından söz edilə bilməz. Buna görə İslamın ilk əsrlərindən bu yana Hz. İsanın nüzulu “zərurati-diniyyədən” olmuşdur. İnsanlar kimi elmin də nəsəbi vardır. Buna görə Hz. İsa gələcək deyənlərin istinadı **Quran və Sünnədir. Enməyəcək deyənlərin nəsəbi isə Cübbaidən şaz olaraq alsaq Abduhdan kənara keçmir.**

Bütün bunlardan sonra deyiləcək tək bir söz qalır o da bu ayədir: “O sizin həqiqi Rəbbiniz olan Allahdır. Artıq haqdan sonra zəlalətdən başqa nə qalır?! Belə isə (haqdan) necə döndərilirsiniz?”.[205]

205. Yunus, 10/32.

# RİSALƏTİN BÖYÜK ŞAHİDİ –"ÜMMİLİK"

Bəzi orientalistlər və onlarla bir çox mövzuda həmrəy olan "Məalçılar" elmi və tarixi faktları görməzlikdən gələrək, Allah Rəsulunun oxuma-yazma bildiyini iddia edirlər. Onlar Allah Rəsulu haqqında Quranda keçən "ümmi nəbi" ifadəsinin "oxuma-yazma bilməyən" mənasında olmadığını iddia edirlər. Onlar "ümmi" sözünün "ümmiyyun" kəlməsindən törədiyini və "xalqın içərisindən çıxan, xalqa aid" mənasına gəldiyini irəli sürürlər. Birbaşa və ya dolayı olaraq Allah Rəsulunun oxuma-yazma bilmədiyini xəbər verən ayələri isə, Peyğəmbərimizin xarici dildə bir mətni oxuya bilməməsi şəklində izah edirlər.

Bu araşdırmada Allah Rəsulunun -haşa- Qurani-Kərimi əvvəlki kitablardan təsirlənərək yazdığını sübut etməyin mümkünsüzlüyünü əqli və nəqli dəlillərlə izah edəcəyik. Sünnəni inkar edən "Məalçılar" ilahi bilgi sayılan vəhy ilə bəşəri bilgi arasındakı fərqi görməzlikdən gəlir, "ümmi" sözü ilə "cahil" sözünü eyniləşdirirlər. Onlar "ümmiliyi" inkar edərək Allah Rəsulunu müdafiə etdiklərini deyirlər. Onların iddialarına keçməzdən əvvəl elmin nə olduğunu və səmavi bilgi ilə bəşəri bilgi arasındakı fərqi qısaca izah etməkdə fayda var.

### Elm

Elm "bilmək", "idrak", "bilik", "məlumat" mənalarındadır. Elmin mahiyyətinin nə olduğu alimləri düşündürmüşdür. Elmin tə-

rifə ehtiyacı olmadığını deyənlərlə yanaşı,[206] Cüveyni və tələbəsi Qəzali kimi elmi tərif etməyin çətin olduğunu deyənlər də olmuşdur. Fəxrəddin Razi isə, elmin mahiyyətinin özündən olduğunu, buna görə də, tərif verməyin mümkünsüzlüyünü bildirmişdir.

Elmə tərif verənlər, onun ağıl və hisslərlə əlaqəli olduğunu bildirirlər. Filosoflara görə, elm "bir şeyin surətinin ağılda yaranması", kəlam alimlərinə görə, ağıl və hisslərlə əlaqəli hər şeyin tanınmasını təmin edən sifət[207] və ya bir şeyi olduğu kimi dərk etmək qabiliyyətidir.[208]

Elm iki yerə ayrılır: 1. Zəruri elm. 2. İstidlali elm.

1. Zəruri elm

Düşünmədən, dəlilə müraciət etmədən, öz-özünə formalaşan məlumatlar «zəruri elm» adlanır. Məsələn, hamı bilir ki, ilin dörd fəsli var. Od yandırıcıdır. Bunlar hamının bildiyi zəruri bilgilərdir.

2. İstidlali elm

"İstidlal" hər hansı sübut və ya dəlilə müraciət etməkdir. Məlum olmayanı əldə etmək üçün məlum olanlardan istifadə etmək "istidlal" adlanır. İstidlali elmə "kəsbi" elm də deyilir. İnsan, bu elmi ancaq elmi qanunlardan istifadə edərək öyrənə bilər.

Bundan başqa, elm yaranma etibarilə də iki yerə bölünür: Allahın zatı ilə mövcud olan elmə "qədim", sonradan yaranan və insanlara mənsub elmə isə "hədis" elm deyilir.[209]

## Peyğəmbərlər və elm

Allah-Təala, həm bilən (alim) həm də öyrədəndir. Hz. Adəmə "əsmanı" - adları O öyrətmişdir. İnsanlar arasından seçdiyi

206.əl-Cürcani, *ət-Tırifat*, Darul-Kutubil-ilmiyyə, Beyrut, 2000, s.157.

207. ət-Taftazani, *Şərhul-əqaid*, Məktəbətul-Buşra, Kəraçi, 2004, s. 60.

208. əl-Cürcani, *e.ə.*, s. 157.

209. əl-Cürcani, *e.ə.*, s. 157.

peyğəmbərlərə əkib-biçmək, gəmi inşa etmək, dəmirə şəkil vermək, tikmək, xəstələri müalicə etmək kimi sənət və peşələri də Allah vəhy etmişdir. Allahın elmi hər şeyi ehtiva edir. O, hər şeyi biləndir.

Bəndələrindən istədiyini peyğəmbər seçmiş,[210]onların qəlbinə unutmayacaqları şəkildə vəhyi yerləşdirmişdir. Belə ki, Uca Allah nazil olan ayələri, unutmaq qorxusu ilə Cəbrayılla (ə.s) birlikdə təkrar edən Allah Rəsuluna xitabən belə buyurmuşdur: *“(Ya Peyğəmbər! Cəbrayıl sənə Quran oxuduğu zaman) onu tələm-tələsik əzbərləmək üçün dilini tərpətmə! (Sən də onunla birlikdə Quranı təkrar etmə, yalnız dinlə! Çünki onu (sənin qəlbində) cəm etmək, (dilində) oxutmaq Bizə aiddir. Biz onu (Cəbrayılın dili ilə) oxutduğumuz zaman oxunmasını diqqətlə dinlə”.*[211] Vəhyin Allah Rəsulunun qəlbində qorunduğunu bildirən ayələrdən biri də budur: *“(Ya Peyğəmbər!) Biz sənə (Quranı) oxudacağıq və sən (onu) unutmayacaqsan”.*[212]

## Peyğəmbərlər və dil

Peyğəmbərlər vasitəsilə göndərilən ilahi bilgini oxumaq, anlamaq, qorumaq və nəsildən-nəsilə ötürmək üçün insanlar yazını kəşf etdilər. Yazının kəşfindən sonra elmin inkişafı sürətləndi.

İlahi vəhy peyğəmbərlərə bilavasitə verilir və unudulmur. Buna görə də, onların yazmağı bacarması şərt deyil. Allah Rəsulu da “ümmi” idi. Yəni oxuyub-yazmağı bacarmırdı. İmam Qurtubi bil-

210. (Ya Peyğəmbər!) Allah: “Dini doğru-dürüst tutun (qoruyub saxlayın), onda ayrılığa düşməyin!” – deyə Nuha tövsiyə etdiyini, sənə vəhy buyurduğunu, İbrahimə, Musaya, və İsaya tövsiyə etdiyini dində sizin üçün də qanuni etdi. Sənin dəvət etdiyin (tövhid dini) müşriklərə ağır gəldi. Allah istədiyi kimsəni özünə (peyğəmbər) seçər və tövbə edib Ona tərəf qayıdan kimsəni də doğru yola yönəldər!. Şura, 42/13.

211. Qiyamə, 75/16-17-18.

212. Əla, 87/6.

dirir ki, Allah-Təalanın Peyğəmbərimizin kamal sifətlərindən biri kimi göstərdiyi və buna görə təriflədiyi "ümmilik", Onu ittihamlardan qorumaq üçündür. Ancaq bu xüsusiyyət Allah Rəsulundan başqasında olsa qüsur sayılır. Çünki yazmağı bacarmaq elm öyrənməyin yollarından biridir. Allah-Təala oxuma-yazma bilmədiyi halda Rəsuluna möcüzə olaraq əvvəlki və sonrakı nəsillərin elmini lütf etmişdir. Bu, onun doğruluğuna dəlalət edən əsas xüsusiyyətlərdən biridir. Yəni başqa insanlarda qüsur sayılan xüsusiyyət Onun üçün kamilliyin göstəricisidir.[213]

"Ümmilik" Allah Rəsuluna yönəldilən "əvvəlki kitablardan öyrəndiklərini danışır" şəklindəki ittihamların qarşısını almışdır. Yəni heç kim Onun haqqında "dediklərini filan kitablardan oxuyub" deyə bilməz. Çünki O, "ümmi" idi. Allah-Təala Ona heç kimin öyrənə bilməyəcəyi qeybə dair xəbərləri öyrətmişdi.[214]

Dili və məzmunu ilə böyük söz ustalarını heyrətləndirən Qurani-Kərimin "ümmi" peyğəmbər tərəfindən təbliğ edilməsi, Quran haqqında uydurulan iddiaların tamamilə əsassız olduğunu göstərir. Düzənlikdə ucalan dağ kimi, "ümmiliyin" saflığı da Quranın möcüzəviliyini açıq-aşkar göstərmişdir.

## Dilin inkişafı

Dilçilər özlərindən dil icad etmirlər. Onlar mövcud dil üzərində araşdırmalar aparır, fikir və təkliflərini bildirirlər. Qayda-qanunlar da dilin əsasını təşkil etmir, dilə aid olurlar. Çünki qaydalardan əvvəl də dillər var idi. Ərəb dilində ismi, cümlənin mübtəda və xəbərdən ibarət olduğunu bilməyən bədəvilər danışmaqda heç bir çətinlik çəkmirlər. Yəni danışıq üçün dil qaydalarını bilməyə ehtiyac yoxdur. Bu qayda bütün dillər üçün keçərlidir.

---

213. Qadı İyaz, *İkmalul-mulim bi fəvaidiMüslim*, Dipnot: 3, Beyrut, 2004, I, s. 335.

214. Yusuf, 12/102.

Zaman keçdikcə bütün dilə yeni sözlər əlavə olunur. Həmin sözlərin mənasını və sinonimlərini o dildə danışanlar daha yaxşı bilir. Elə buna görə də, dilçi alimlər ərəb dilində hər hansı sözün mənası haqqında qərar vermək üçün bu dili daha təmiz bilən bədəvilərə müraciət edirdilər. İstənilən dil, dilçilərdən çox həmin dili danışan millətlə xatırlanır.

Ərəbcə nazil olan Quranı anlamaq ancaq ərəb dilini bilməklə mümkündür. Quranda keçən "ümmi" sözünün hansı mənaya gəldiyini bilmək üçün də ərəb dilini yaxşı bilmək, ərəblərin həmin sözü hansı mənada işlətdiyindən xəbərdar olmaq lazımdır.

### "Ümmi"

"Ümmi" sözü ərəb dilindəki "ümm" kəlməsindən törəyib. Mənası "ana", "mənbə", "əsl" deməkdir. "Yazmağı bacarmayan", "anadan olduğu kimi qalan"[215], "yeni məlumatlardan xəbərsiz" insana "ümmi" deyilir. Yazmaq sonradan qazanılan qabiliyyətdir. Buna görə də yazmağı bacarmayan insan yeni doğulmuş körpə kimi "ümmi"dir. Yəni heç nədən xəbəri yoxdur. Nə yazmağı bacarır, nə də oxumağı.

Rəsulullah bir hədisində, *"Biz ümmi ümmətik. Nə yazmağı, nə də hesablamağı bacarırıq"*, - buyurmuşdur. Hədisdəki "ümmi" sözü anadan olan körpə kimi yazmağı və hesablamağı bacarmayan[216] insan mənasındadır.

Quran və Sünnədə işlədilən "ümmi" sözü haqqında alimlər iki fikir irəli sürmüşlər[217]:

---

215. İbn Manzur, *Lisanul-Arab*, Darul-Kutubil-ilmiyye, Beyrut, 2009, XII, s.34.

216. İbn Manzur, *e.ə.,* XII, s.34.

217. Bu haqdakı fikirlərdən biri də belədir: ""Ümmi" Məkkəli mənasında işlənmiş ola bilər. Çünki Məkkənin adlarından biri Ümmül-Qura idi." Bax: əl-Qurtubi, *əl-Camiu li əhkamil Quran*, s.190.

1. "Ümmi" sözü anaya aidlik bildirir. Yəni anadan olduğu kimi dəyişməyən mənasındadır. Rəsulullah da dünyaya gəldiyi kimi təmiz qalmış[218] və bütün öyrəndiklərini vəhy yolu ilə almışdır[219].

2. Rəsulullahın oxuyub-yazmağı bacarmaması, Onun ərəblərə mənsub olduğuna işarədir[220].

Rəsulullahın "ümmiliyi" hər iki mənada oxuma-yazma bacarmadığını göstərir.

### "Ümmi" və "cahilin" fərqi

Elmi müxtəlif üsullarla öyrənmək olar: oxuyaraq, yazaraq, dinləyərək, hiss və təcrübə yolu ilə və s. Oxuma-yazma bilən hər insana alim, hər "ümmi"yə də "cahil" deyə bilmərik. Oxuyub-yazmağı bacaran bir insan "cahil", alim insan da "ümmi" ola bilər. Dinləyərək bir çox kitab əzbərləyən və elmə yiyələnən "ümmi" alimlərin sayı çoxdur.

Alim sözünün antonimi "cahil", "ümmi" sözünün antonimi isə oxuma-yazma bilәndir. Yəni "ümmi" və "cahil" sözlərini bir-birinə qarışdırmamaq lazımdır. Necə ki, Rəsulullah "ümmi" olduğu halda Məkkəlilərin bilmədiyi bir çox şey haqqında – keçmişdə yaşayan qövmləri, axirəti, həşri və s. – bilirdi. Danışdıqlarını heç kimdən öyrənərək minnət altına düşməmişdi. "Ümmilik" Onu hər cür lazımsız bilikdən qorumuşdur.

### Quranda "ümmi"

"Ümmi" sözü Quranda tək və cəm şəkildə altı ayədə keçir. Bu ayələrin üçü ərəblər, ikisi Rəsulullah, biri isə yəhudilər haqqındadır.

218. əl-Alusi, *Ruhul-məani,* s.75.

219. Fəxrəddin Razi, *Təfsirul-Kəbir*, Darul-Fikr, Beyrut, 1990, XV, s.20.

220. Razi, *e.ə.,* XV, s.20; Əbu Həyyan, *Bəhrul-muhit*, Beyrut, 1993, IV, s.432; Alusi, *e.ə.*, V, s.75.

**Ərəblər və "ümmilik"**

İslam dini gələnə qədər ərəblərdə yazı mədəniyyəti formalaşmamışdı. Onlar tarixi və ədəbi məlumatları əzbərləyərək hifz edirdilər. Ərəblərdə yazının formalaşması Rəsulullahın dünyaya gəldiyi dövrlərə təsadüf edir. İmam Şabi ilk dəfə ərəb dilində yazan şəxsin Əbu Süfyanın atası Hərb ibn Ümeyyə olduğunu bildirir. O, yazmağı Ənbar qəbiləsindən öyrənmişdi.[221]

Tarixi məlumatlardan da görürük ki, o dövrdə Məkkəlilərin demək olar ki,  hamısı "ümmi" idi. Məhz bu səbəbdən Quranda onlar haqqında "ümmi" ifadəsi işlədilmişdir. Həmin ayələrə nəzər salaq:

**"(Əksəriyyəti yazıb-oxumaq bilməyən) ümmi ərəblərə özlərindən peyğəmbər göndərən Odur. (Bu Peyğəmbər) əvvəllər haqq yoldan açıq-aşkar azsalar da, onlara (Allahın) ayələrini oxuyar, onları (günahlardan, şirk və küfr çirkabından) təmizləyər, onlara Kitabı və hikməti (Quranı və şəriəti) öyrədər."**[222]

Allah "ümmi" ərəblərə özləri kimi oxuma-yazma bilməyən peyğəmbər göndərəcəyini açıq-aşkar bildirmişdir. Bu ayənin təvilə (izaha) ehtiyacı yoxdur.

**"(Ya Rəsulum!) Əgər onlar (yəhudi və xaçpərəstlər) səninlə mübahisə edərlərsə, belə de: "Mən özümü ardımca gələnlərlə birlikdə Allaha təslim etmişəm". Kitab verilmiş şəxslərə və savadsızlara (ərəb müşriklərinə) de: "Siz də təslim (müsəlman) oldunuzmu?" Əgər təslim olarlarsa (islamı qəbul edərlərsə), doğru yola yönəlmiş olarlar, yox, əgər üz döndərərlərsə, (sənə bir zərər gəlməz), sənin vəzifən ancaq (haqqı) təbliğ etməkdir. Allah, şübhəsiz ki, bəndələrini görəndir!"**[223]

221. Halil İbrahim Molla Hatır, *ən-Nəbiyyul-Mustafa*, Məkkə, tarixsiz, s.174.

222. Cumuə, 62/2.

223.Ali-İmran, 3/20.

Ayədə əvvəlcə Əhli-kitab, sonra da “və” bağlayıcısı ilə “ümmilər” nəzərdə tutulmuşdur. Buradakı “ümmilər” sözü ərəblər haqqındadır. Bağlayıcı, həmin sözün Əhli-kitaba aid olmadığını göstərir.

**“Kitab əhlindən elə kəslər vardır ki, əgər onlara bir qinar (çoxlu) əmanət verərsənsə, onu tamamilə sənə qaytararlar; elələri də vardır ki, onlara təkcə bir dinar qızıl əmanət versən, başlarının üzərində möhkəm durub tələb etməyincə sənə qaytarmazlar. Bunun səbəbi budur ki, onlar: “Ümmilərə görə (kitab əhli olmayan cahil ərəblərin mallarını mənimsəməyə görə) bizə irad tutulmayacaq”, – deyər və bilə-bilə Allaha qarşı yalan söyləyərlər.”**[224]

Yəhudilərdəki əmanətə xəyanət düşüncəsi, dinlərindəki “Allah “ümmi” ərəblərin mallarını mənimsəməyi onlara halal buyurmuşdur” inancına əsaslanır.[225] Bir qureyşli yəhudilərin böyük alimlərindən sayılan Fənhas ibn Azuraya saxlamaq üçün bir dirhəm vermişdi. Qureyşli dirhəmini geri istəyəndə Fənhas, “Oxuma-yazma bilməyənin haqqı var ki? Vəsiqəsi olmayan, üstəlik başqa din mənsublarının haqqını yemək bizə halaldır.” – demişdir.[226]

Qısacası, yuxarıdakı ayələrdə “ümmi” sözü yazıb-oxuma bilməyən mənasında işlənmişdir.

**Rəsulullah və “ümmilik”**

Quranda Rəsulullahın, qəbiləsindəki insanlar kimi “ümmi” olduğu bildirilir. Həmin ayə belədir:

**“O kəslər ki, əllərindəki Tövratda və İncildə (adını, vəsfini və əlamətlərini) yazılmış gördükləri rəsula–ümmi**

224.Ali-İmran, 3/75.

225. İbn Kəsir, *Təfsiru ibn Kəsir*, Beyrut, 1399, I, s.292.

226. Elmalılı M. Hamdi Yazır, *Hak dini Kuran dili*, İstanbul, tarixsiz, II, s.393.

**(heç kəsin yanında oxuyub elm öyrənməmiş) peyğəmbərə tabe olurlar. (O Peyğəmbər) onlara yaxşı işlər görməyi buyurar, pis işləri qadağan edər, təmiz (pak) nemətləri halal, murdar (napak) şeyləri haram edər, onların ağır yükünü yüngülləşdirər və üstlərindəki buxovları açar (şəriətin çətin hökmlərini götürər). Ona (o Peyğəmbərə) iman gətirən, yardım göstərən və onunla (Quranın) ardınca gedənlər məhz onlar nicat tapanlardır!”**[227]

Ayədə Rəsulullahın Tövrat və İncildə müəyyən vəsf və əlamətlərinin bildirildiyi nəzərə çatdırılır. Üstəlik həmin kitablarda Onun “ümmi” rəsul olaraq gələcəyi və insanların Ona - “ümmi” peyğəmbərə tabe olacağı bildirilir.

Rəsulullahın oxuma-yazma bilməməsi Ona xas “rəsul” və “nəbi” sifətləri kimidir. Yəni O, peyğəmbərlər arasında “ümmi” olaraq tanınır. Hz. Musa Merac gecəsi Onunla salamlaşarkən, “Ümmi peyğəmbərə salam olsun” demişdir. Yəni, Hz. Musa Onun “ümmi” olduğunu bildiyi üçün belə xitab etmişdir.[228]

**“(Ya Rəsulum!) De: “Ey insanlar! Mən Allahın sizin hamınıza göndərilmiş peyğəmbəriyəm. (O Allah ki) göylərin və yerin hökmü Onundur, Ondan başqa heç bir ilah yoxdur. O dirildir və öldürür. Buna görə də Allah, eləcə də Onun Allaha və Allahın sözlərinə (ayələrinə, nazil etdiyi kitablara) inanan və ümmi peyğəmbər olan Rəsuluna iman gətirin və ona tabe olun ki, doğru yolu tapa biləsiniz!”**[229]

İslam insanlara və cinlərə göndərilən son ümumbəşəri dindir. Bu ayədə özünə vəhy olunan, endirilənləri olduğu kimi çatdıran “ümmi” peyğəmbərə iman gətirməyin vacibliyi və doğru yolun Ona tabe olmaqdan keçdiyi bildirilir.

---

227.Əraf, 7/157.

228. Əhməd ibn Hənbəl, *Müsnəd*, I, 257.

229. Əraf, 7/158.

### Yəhudilər və "ümmilik"

**"Onların (yəhudilərdən) bəziləri də avamdırlar (bisavaddırlar), kitabı (Tövratı) bilməzlər. Uyduqları yalnız (bir sıra) boş arzulardır (xam xəyallardır). Onlar ancaq zənnə qapılırlar."**[230]

"Ümmi" olub-olmadığına görə yəhudilər iki qrupa ayrılır. Ayədə bəhs olunanlar alimlərin təhrif etdiyi Tövratı həqiqət zənn edənlərdir. Onlar alimlərin batil izahlarının "vəhy" olduğuna inanırlar.

### Rəsulullahın "ümmi" olduğunu göstərən dəlillər

Qurandan əvvəl endirilən səmavi kitablarda Rəsulullahın "ümmi" olduğu bildirilmişdir. Həmin din mənsubları da gözlənən peyğəmbərin "ümmi" olacağını deyirdilər. Rəsulullahın həyatına şahid olan səhabələr Onun "ümmi" olduğuna şahiddir. Dilçi, müfəssir, mühəddis və s. alimlər Onun "ümmi" olduğunu qəbul edir. Rəsulullahın oxuma-yazma bilməməsinin dəlilləri sadəcə Quran ayələri deyil. Bunun əqli dəlilləri də var. Həmin dəlillərə sıra ilə nəzər salaq:

### Ayələr

Orientalizm inkişaf edənə qədər yazılan təfsirlərdə "ümmi" sözü oxuma-yazma bilməyən mənasında izah edilirdi. Rəvayət təfsirlərinin Quran və müsəlmanlar arasında pərdə olduğunu iddia edən Muhamməd Abduh belə "ümmi" sözünə digər müfəssirlər kimi eyni mənada izah vermişdir. [231]

---

230. Bəqərə, 2/78.

231. Bütün müfəssirlər "ümmi" sözünün yazıb-oxuma bilməyən mənasına gəldiyini bildirmişdir. Həmin izahlar çox uzun olduğundan bura yazmağa ehtiyac görmədik.

Quranda "ümmi" sözü ilə Rəsulullahın oxuma-yazma bilmədiyi göstərilmişdir. Həmin ayələrdən biri belədir: **"(Ya Rəsulum!) Sən bundan (bu Qurandan) əvvəl nə bir kitab oxumusan, nə də onu əlinlə yazmısan. Əgər belə olsaydı, onda batilə uyanlar (onun barəsində) şəkk-şübhəyə düşərdilər (Onu hardansa oxuyub öyrənmişdir, deyərdilər)."**[232]

Bu ayədə Rəsulullahın heç bir kitab oxumadığı bildirilmişdir. "Nə bir kitab oxumusan, nə də yazmısan" əvəzinə "nə də onu əlinlə yazmısan" ifadəsi işlədilmişdir. Bu ifadədə şəkk-şübhəyə yer yoxdur. Ayədəki ifadə çox açıq və başadüşüləndir. "Əl" sözünün xüsusi qeyd edilməsini belə izah etmək olar: Yazı əl ilə yazılır. Rəsulullah da yaza bilmirdi. Buna görə də, Onun yaza bilmədiyini daha aydın ifadə etmək üçün "nə də onu əlinlə yazmısan" ifadəsi işlədilmişdir. Bunu bir misalla izah edək: ərəbcə "نَظَرْتُ" "baxdım" sözü ümumi mənadadır. Ancaq "نَظَرْتُبِعَيْنِي" "gözümlə baxdım" ifadəsi daha dəqiqdir. Ayədəki "وَلَاتَخُطُّهُ" sözünün əvvəlindəki inkar artiklı həmin felin indiki və gələcək zamanda mümkün olmadığını bildirir. Bu da o deməkdir ki, "nə indi, nə də gələcəkdə əlinlə yazarsan". Yəni gələcədə də yaza bilməyəcəksən.

Əgər Rəsulullah oxuma-yazma bilsəydi müşriklər ona "hardansa oxuyub öyrənmişdir" deyə böhtan atardılar. Tövratda son peyğəmbərin "ümmi" olacağı bildirilirdi. Yəhudilər də bundan xəbərdar idilər. Əgər Rəsulullah oxuma-yazma bilsəydi yəhudilər onun peyğəmbərliyinə şübhə edərdilər.[233]

Rəsulullah Allahdan vəhy alana qədər Quran və imanın şərtləri haqqında heç nə bilmirdi. Yəni "ümmi" idi. Bu haqda belə buyurulur: **"(Ya Rəsulum! Əvvəlki peyğəmbərlərə vəhy nazil etdiyimiz kimi) sənə də beləcə əmrimizdən olan bir vəhy (möminlərə mənəvi həyat verən Quran) göndərdik. Sən (bundan əvvəl) kitab nədir, iman nədir bilməzdin. Lakin**

---

232. Ənkəbut, 29/48.

233. Rəsulullahın risalətini inkar etsələr də, şübhələrinə heç bir sübut tapa bilmədilər.

**Biz onu bəndələrimizdən dilədiyimizi haqq yola qovuşdurmağımız üçün bir nur etdik. Sən (onunla insanları) düz yola yönəldirsən (islam dininə dəvət edib haqqa qovuşdurursan)."**[234]

Quran nazil olarkən dünyada iki səmavi din – yəhudilik və xristianlıq vardı. Hər iki din insanlar tərəfindən təhrif olunmuş, əslini itirmişdi. İslamı qəbul etməyənlər Qurandakı qeybə və əvvəlki ümmətlərə aid ayələrin həmin dinlərdən götürüldüyünü iddia etməyə başladılar. Uca Allah bu cür iddiaları əzəli elmi ilə bildiyindən son peyğəmbərin "ümmi" olmasını istəmişdir.

Tövrat və İncil bir dəfəyə nazil olmuşdur. Ona görə ki, Hz. Musa və Hz. İsa yazıb-oxumağı bilirdilər. Rəsulullah isə "ümmi" idi. Allah Quranı 23 il ərzində, tədricən nazil etdi ki, Rəsulu Quranı daha asan hifz etsin. Kafirlər Quranın bir dəfədə nazil olmasını tələb edirdilər. Allah onların bu tələbinə belə cavab vermişdir: ***"Kafirlər: "Quran ona (Muhəmmədə) bütöv (birdəfəlik) endirilməli idi!" – dedilər. (Ya Rəsulum!) Sənin ürəyinə səbat (qətiyyət) vermək üçün Biz onu ayə-ayə (tədricən) nazil etdik. (Quranın az-az endirilib, ağır-ağır oxunması onun əzbərlənməsini və mənalarının anlaşılmasını asanlaşdırır)."***[235]

## Hədislər

Rəsulullah "ümmi" sözünü oxuma-yazma və hesablama bilməyən insan şəklində izah edir. Bir hədisində, "Biz yazmağı və hesablamağı bilməyən ümmi ümmətik. Ay belədir..."[236] (Yəni ay bəzən 29, bəzən də 30 gündür)

234. Şura, 42/52.

235. Furqan, 25/32.

236. Buxari, Savm, 13; Müslim, Sıyam, 2; Əbû Davud, Siyam, 4; Nəsai, Siyam, 17; Əhməd ibn Hənbəl, *Müsnəd*, II, 43.

Hirada ilk nazil olan ayələr Rəsulullahın oxuma-yazma bilmədiyini açıqca göstərir. Belə ki, Hirada ilk vəhy gələrkən Cəbrayıl mələk Ona oxumağı əmr etmiş, O isə: "أَنَا مَا بِقَارِئٍ *Mən oxuya bilmirəm"* şəklində cavab vermişdir. Rəsulullah Hirada yaşadığı həmin hadisəni belə nəql edir:

"Cəbrayıl mənə mələk olduğunu, Allahın məni rəsul seçdiyini bildirmək məqsədilə özünü göndərdiyini dedi. Mənə dəstəmaz almağı öyrətdi. Vücudum tamamilə təmiz olduqda, məndən oxumağımı istədi. Mən də oxuya bilmədiyimi bildirəndə, məni qollarının arasına alaraq sıxdı və dərhal buraxıb, yenə də oxumağımı tələb etdi. Mən oxuya bilmədiyimi bildirdikdə, yenidən məni qucaqlayaraq daha qüvvətlə sıxdı və sonra bir daha oxumağımı istədi. Mən yenə oxuya bilmədiyimi dedim. O, məni yenidən qollarının arasına alaraq əvvəlkilərdən bərk sıxdı və qollarını boşaldaraq dedi[237]: **"(Ya Peyğəmbər! Qurani-Kərimi bütün məxluqatı) yoxdan yaradan Rəbbinin adı ilə (bismillah deyərək) oxu! O, insanı laxtalanmış qandan yaratdı. (Ya Peyğəmbər!) Oxu! Sənin Rəbbin ən böyük kərəm sahibidir! O Rəbbin ki, qələmlə (yazmağı) öyrətdi. (O Rəbbin ki) insana bilmədiklərini öyrətdi"**[238].

Bu dialoq Rəsulullahın ilk vəhy gələndə "ümmi" olmasının dəlilidir. Çünki oxu əmrinə üç dəfə "mən oxuya bilmirəm", - deyə cavab vermişdir.

"Ümmi" cəmiyyətdə, "ümmi" anadan dünyaya gələn Rəsulullahın "ümmiliyi" əbədi diyara köçənə qədər davam etmişdir.

"Ümmilik" qiyamət günü həm Rəsulullahın, həm də ümmətinin vəsfi olacaq. Abdullah ibn Abbasın nəql etdiyi hədisdə Allah Rəsulu belə buyurur: *"Biz dünyaya göndərilən ümmətlərin sonuncusuyuq. Ancaq axirətdə ilk hesaba çəkilən biz olacağıq. O gün bizə deyiləcək: "Ümmi ümmət və peyğəmbəri haradadır?"*[239]

237. Buxari, Vəhy, 1.

238. Ələq, 96/1-5.

239. İbn Macə, Zöhd, 37.

Rəsulullah peyğəmbərliyinin müxtəlif dövrlərində dəfələrlə "ümmi" olduğunu bildirmişdir. Abdullah ibn Amr nəql edir ki, Rəsulullah yanıma gəlmişdi. Dünya ilə vidalaşan insan kimi üç dəfə: *"Mən Muhamməd ümmi peyğəmbərəm. Məndən sonra peyğəmbər gəlməyəcək"*, - dedi.[240]

Səhabələrdən biri Peyğəmbərimizdən salavat haqqında sual soruşdu:

"Ey Allahın Rəsulu! Allah sizə salavat gətirməyimizi əmr edib. Necə salavat gətirək?"

Rəsulullah cavab vermədi. Səhabə soruşmağına peşman oldu. Bir müddət sonra belə dedi:

-*"Allahım! Ümmi Peyğəmbər Muhammədi və ailəsini ucalt deyə bilərsiz"*.[241]

**Səhabələrin şahidliyi**

Səhabələr Allah Rəsulunu nümunə götürür, Onun kimi yaşamağa can atırdılar. Bu səbəbdən onlar Rəsulullahın həyatı haqqındakı hər şeyi – sözləri, səfərləri, əxlaqı, şəmaili, ailə həyatı və s. nəql etmişlər. Onların nəql etdiklərinin hamısı kitablarda toplanmışdır. Beləcə tabeun və sonrakı nəsillər Rəsulullahın həyatı haqqında ətraflı məlumat əldə etmişdir.

Rəsulullahın peyğəmbərliyə qədərki həyatından da ətraflı bəhs olunmuşdur. Siyər kitablarında Onun nəsəbi, doğumu, uşaqlıq və gəncliyi, səfərləri, görüşüb-söhbətləşdiyi və ortaqlıq etdiyi insanlar və s. haqqında kifayət qədər məlumat var. Ancaq heç bir siyər kitabında Rəsulullahın oxuma-yazma bildiyini göstərən ipucu yoxdur. Həmişə yanında olan səhabələri də Onun ümmi olduğuna şahiddir.

240. Əhməd ibn Hənbəl,*Müsnəd*, II, 172, 212.

241. Əbu Davud, Səlat, 178-179.

Rəsulullahın vəfatından sonra Hz. Əlinin Kufədə belə dediyi bildirilir: *"Toxumu cücərdənə və insanı yaradana and olsun! Ümmi Nəbi mənə bildirmişdi ki, məni ancaq möminlər sevəcək, münafiqlər kin bəsləyəcək."*[242]

Abdullah ibn Abbas Rəsulullah haqqında bunları deyir: *"Allah rəsulu oxuma-yazma bilməyən, hesablamağı bacarmayan ümmi idi."*[243]

Allah Rəsulunun "ümmi" olduğunu göstərən hadisələrdən biri belədir:

Hz. Abbas Məkkədə idi. Qureyş müsəlmanlarla müharibəyə hazırlaşırdı. Hz. Abbas Peyğəmbərimizə Qureyşin müharibə üçün yola çıxdığını bildirən məktub yazdı. Bəni Ğifar qəbiləsindən bir nəfərlə həmin məktubu Mədinəyə göndərdi. Peyğəmbərimiz məktubu açdı və oxuması üçün Übeyy ibn Kaba verdi. Übeyy məktubu oxudu. Rəsulullah ona oxuduqlarını sirr olaraq saxlamağı tapşırdı.[244]

Əshabın Rəsulullaha qarşı sonsuz sevgisi siyər kitablarında öz əksini tapır. Səhabələr Ondan qalan ən kiçik xatirələri belə yaşadaraq nəql etmiş və bu xatirələr əsrlərlə qorunub saxlanmışdır. Həqiqətən də, Onun öz dəsti xətti ilə yazdığı yazı olsaydı, qorunub saxlanar və bu günədək gəlib çatardı.

## Tarixi dəlillər

Rəsulullahla eyni dövrdə yaşayan insanlar iki qrupa bölünür:

---

242. Müslim, İman, 33.

243. əl-Qurtubi, *e.ə.*, VII, s.190.

244. Əgər Rəsulullah yazıb-oxuma bilsəydi strateji əhəmiyyəti olan məktubu Übeyyə oxutmaz və ondan oxuduqlarını sirr olaraq saxlamağı istəməzdi. Bax: Muhamməd Rza, *Muhammed rasulüllah*, Beyrut, tarixsiz, s.80.

1. Ona iman etməyən Məkkə müşrikləri, Mədinədə yaşayan kafir, münafiq və yəhudilər.

2. Ona iman edən müsəlmanlar.

Bu iki qrupdan heç kim Allah Rəsulunun oxuma-yazma bildiyini iddia etməmişdir. Düşmənləri Rəsulullaha mane olmaq üçün əllərindən gələni edirdi. **"(Ya Rəsulum!) Sən bundan (bu Qurandan) əvvəl nə bir kitab oxumusan, nə də onu əlinlə yazmısan..."**[245] ayəsi nazil olanda düşmənlərindən heç biri, "bu ayə həqiqətə ziddir" deməmişdir. Halbuki onlar Rəsulullaha düşmənçilik üçün ən kiçik fürsəti belə fövtə vermirdilər. Üstəlik Rəsulullahın peyğəmbərlikdən əvvəlki həyatına yaxından bələd idilər. Buna rəğmən Onun haqqında bir dəfə də olsa "oxuma-yazma bacarırdı" deyə bilmədilər. Çünki Allah Rəsulu "ümmi" idi. Onlar da bunu çox yaxşı bilirdi.

"Quranı o yazıb" deyə bilməyənlər, **"Onlar: "Bu, keçmişdəkilərin nağıllarıdır. O bunları (başqasına) yazdırmışdır. Bunlar səhər-axşam onun özünə oxunur" – dedilər."**[246] Ayədəki "iktətəbə" feli "istəktəbə" mənasındadır və əmr bildirir. Bu da "ayələri özü üçün başqasına yazdırmışdır" deməkdir.[247]

Ona iman edənlərin hamısı eyni deyildi. Əgər ayəyə zidd nə isə olsaydı İsra və Meracı qəbul etməyənlər kimi irtidad edənlər çıxardı.

Rəsulullah göndərdiyi dəvət məktublarını katiblərə yazdırmışdır.[248] Əgər özü yazmağı bacarsaydı bunu katiblərə yazdırmazdı. Qısacası, bütün tarixi məlumatlar Rəsulullahın "ümmi" olduğunu təsdiq edir.

245. Ənkəbut, 29/48.

246. Furqan, 25/5.

247. İbn Manzur, *e.ə.*, I, s.698; Molla Hatır, *e.ə.*, s.140.

248. Bax: Molla Hatır, *e.ə.*, s.111.

## Əqli dəlillər

İslam gələrkən Məkkədə cəmi 17 nəfər oxuma-yazma bilirdi. Bu səbəbdən əsas hadisələr şifahi şəkildə nəsildən-nəsilə ötürülür və şeirləşdirilirdi. Şeirlər bütpərəstlik və qəbilə mədəniyyətinə aid hadisələrlə zəngin idi. İnsanlar daha çox ədəbiyyata, xüsusən də şeirə maraq göstərirdi. Tövrat və İncil ibrani dilində olduğundan xalq həmin kitablarda yazılanlardan bixəbər idi.

Quran məhz belə bir dövrdə nazil olmağa başladı. Üstəlik Quranda məkkəlilərin o günə qədər heç eşitmədiyi hadisələr, qeybə dair xəbərlər və iman əsaslarından bəhs olunurdu. Bu, onlar üçün yenilik sayılırdı. Nazil olan ayələri heyrət və təəccüblə dinləyən müşriklər, Quranın Rəsulullaha başqası tərəfindən yazdırıldığını iddia etdilər. Bununla nazil olan ayələri şübhə altına salacaqlarını düşünürdülər. Onlar iddia edirdilər ki, Quran Rəsulullaha rum əsilli xristian kölə Cəbr ən-Nəsrani tərəfindən yazdırılır. Köləni cəzalandıran sahibi: “Bunları Muhammədə sən öyrədirsən?”, - deyə soruşduqda kölə: “Xeyir! Allaha and olsun ki, o mənə öyrədir və yol göstərir.” – demişdi. Həmin kölə sonradan müsəlman olmuşdu.[249]

Müşriklərin bu həmləsi boşa çıxdı. Çünki Quranı isnad etdikləri şəxs rum əsilli bir kölə idi. Ərəb dilini də yaxşı bilmirdi. Bu ehtimal olsaydı belə, Məkkə rəislərinin qəbul etmədiyi peyğəmbərdən canını qurtarıb azadlığa qovuşmaq üçün “Bəli, mən öyrədirəm” deməzdi? Yaxud gizlində “Bu kitab mənə aiddir. Yəni ona yox mənə iman edin” deyə insanları öz tərəfinə çəkməzdi? Öz inandığı xristianlığı bir kənara ataraq uydurduğu kitaba (!) inanardı? O dövrün ən məşhur şairlərinin bir surəsinə oxşar surə yazmaqdan aciz qaldığı Quranı ərəb dilini yaxşı bilməyən bir kölə necə yazdıra bilər? Bu cür sualların sayını artırmaq da mümkündür. Məkkəlilər bu suallara heç bir cavab verə bilmədilər. Beləcə iddialarının əsassız olduğu ortaya çıxdı.

Orientalistlər də müşriklər kimi təəccüblənirdilər. Onlara da Muhammədin “ümmi” olduğu halda Quranda yazılanları necə bil-

249. əl-Qurtubi, *e.ə.*, X, s.117.

diyi maraqlı gəlirdi. Onlara “bu Onun peyğəmbərliyinin dəlilidir” deyəndə risaləti qəbul etsəydilər küfrdən qurtulardılar. Ancaq onlar Rəsulullahın oxuma-yazma bildiyini iddia edərək küfr yolunu seçdilər. Tarixi faktlarla iddialarının əsassız olduğu sübuta yetirildikdə isə, Rəsulullahın oxuma-yazma bildiyini hətta bunu ailəsindən belə gizlədiyini irəli sürdülər. İddiaları həqiqətən gülüncdür.

Yazıb-oxumaq qidalanma və su içmək kimi hamının görə biləcəyi bir əməldir. Bir insan yazıb-oxuya bildiyini niyə ailəsindən gizləməlidir?

**Hikməti**

Allah Rəsuluna həm Quran, həm də onun izahı vəhy olunurdu. Allah Rəsulu da o vəhyləri olduğu kimi ümmətinə təbliğ edirdi. Əksinə, məsələn, Peyğəmbərimizin zehnində bəzi əlavə məlumatlar olsaydı, zehindəki elastiklik kəlmə şəklində deyil, məna şəklində bildirilən (qeyri-mətluv) vəhyi sağa-sola çəkə və dolayısilə, fərqli izahlar meydana çıxa bilərdi. Lakin Rəsulullah “ümmi” idi, zehni dupduru və pak idi, başqa fəlsəfə və mədəniyyətlərin təsirinə məruz qalmamışdı. Allahın yardımı və hikməti ilə qorunmuşdu.

Rəsulullahın alim və filosoflardan ən böyük fərqi bildiklərinin vəhyə əsaslanmasıdır. Allah Rəsulunun həqiqi müəllimi Uca Allahdır. Öyrənmək bir ehtiyacdan qaynaqlanır. Rəsulullah isə lazım olan hər şeyi Ondan öyrənəcəkdi. Aləmlərin müəllimi olan Rəsulullahın Allahdan qeyrisindən öyrənməsinə onsuz da, ehtiyac yox idi. Yoxsa Onun “ümmi” olması oxuma-yazmağı əhəmiyyətsiz saymasından irəli gəlmir. Üstəlik Onun peyğəmbərliyinin oxuma-yazma bilməklə heç bir əlaqəsi yoxdur.

O dövrdə ərəblər fəsahət, bəlağət, xitabət və şeirdə mahir idilər. Ukaz və Zül-məcazda ədəbi məclislər təşkil edilir, ədəbi əsərlər nümayiş olunurdu. Orada söz sərrafı “ümmi” şairlər şeir oxuyur və bir-birini mədh edirdilər. Allah belə bir “ümmi” cəmiyyətdən onlar kimi, fəqət onları təəccübləndirən “ümmi” peyğəmbər çıxardı. Üstəlik Ona hər şeyi öyrətdi. Onu kimdənsə öyrənmək

kimi minnət altında qoymadı. **"...Allah sənə Quranı və hikməti nazil edərək bilmədiklərini öyrətdi."**[250]

Allah Rəsulu ərəblərin ən bəlağətli və fəsahətli danışanı idi. Bunu müşriklər də təsdiq edirdilər. O dövrün şairləri, Quranın insan kəlamı olmadığını çox yaxşı bilir və "bu ancaq sehr ola bilər" deyirdilər. Allah "ümmi" bir peyğəmbər göndərməklə sanki onlara, "Muhamməd dediklərini heç kimdən öyrənməyib. Çünki o "ümmidir". Bu təqdirdə Quranın Allahdan gəldiyini qəbul etməkdən başqa yolunuz yoxdur", - deyirdi.

Allah Quranı Rəsulunun qəlbinə tədricən[251] - 23 ildə nazil etmişdi. Buna görə də Rəsulullahın yazıb-oxuya bilməyinə ehtiyac yox idi. Üstəlik Allah Ona oxuduğunu unutmamaq kimi bir nemət vermişdi.[252] Məlumdur ki, kor insanların hafizəsi digər insanlara nisbətən daha güclü inkişaf edir. "Ümmi" olduğuna görə Rəsulullahın hafizəsi daha güclü idi.

## Rəsulullahın "ümmi" olmadığını iddia edənlərin dəlili

Rəsulullahın "ümmi" olmadığını iddia edənlərin dəlili Buxarinin nəql etdiyi bu hədisdir:

"Hüdeybiyyə sülh müqaviləsi yazılarkən Süheyl ibn Amr hələ müsəlman olmamışdı. O, müqavilədə Peyğəmbərimizin adının "Allah rəsulu Muhamməd" şəklində yazılmasına etiraz edərək əvəzində "Muhamməd ibn Abdullah" yazılmasını tələb etdi. Rəsulullah müqaviləni yazan Hz. Əliyə dedi ki, "Allah rəsulu" ifadəsini silsin. Hz. Əli isə, "Xeyir! Allaha and olsun ki, həmin ifadəni silə bilmərəm", - dedi. Rəsulullah səhifəni götürdü. Yaxşı yaza bilmirdi və (adını) yazdı".[253]

---

250. Nisa, 4/113.

251. Furqan, 25/32.

252. Əla, 87/6.

253. Buxari, Məğazi, 45

Bu hədislə əlaqəli Buxarinin əsərini şərh edən Ayni belə deyir: "Hz. Əliyə adını yazmağı Allah Rəsulu özü tapşırmışdı. Buna görə də məcazi olaraq yazmaq feli Ona isnad edilmişdir." Süheylinin də dediyi kimi, həmin ifadə əslində belədir: "Allah Rəsulu Əliyə yazmağı əmr etdi."[254] Bəzi rəvayətlərdə isə, Hz. Əli həmin ifadəni göstərdiyi, Rəsulullah da onu sildiyi bildirilir.[255] Bu da Rəsulullaha aid edilən isnadın məcazi olduğunu və ya Onun bir dəfəyə məxsus olmaqla möcüzə ilə adını yazdığını göstərir. Ancaq alimlər deyilənləri mötəbər qəbul etmirlər. Bu fikir ilk dəfə Əbu Vəli əl-Baci tərəfindən səsləndirilmişdir. Əndəlüs alimləri onu Qurana qarşı gəldiyini iddia edərək mürtədliklə günahlandırmışlar.[256]

Yuxarıdakı hadisə səhih olsa belə, bu o demək deyil ki, Rəsulullah "ümmi" olmamış, oxuma-yazma bilmişdir. Yəni həmin hadisə Sünnəni rədd edən "Məalçıların" iddiasına dəlil sayıla bilməz. Heç mümkündürmü ki, adını yaza bilməyən bir peyğəmbər tarixin ən böyük söz ustadlarını, mütəfəkkirlərini aciz qoyan kitab yazsın?! Hamı kimi "məalçılar" da buna cavab verməkdən acizdirlər.

## Nəticə

Allah Rəsulu ömrü boyu oxuma-yazma bilməmişdir. Onun "ümmi" olduğunu bildirən ayələr Mədinədə nazil olmuşdur. Oxuma-yazma bilmədiyini göstərən ayə isə Məkkədə enmişdir.[257] "Ümmiliklə" əlaqəli hədislərin hamısı Mədinədə deyilmişdir. Bu da onu göstərir ki, Rəsulullah bütün ömrü boyu "ümmi" olmuşdur. Yəni "ümmilik" onun vəsfi idi.

Məktəbə getməyən, heç bir müəllimdən dərs öyrənməyən "ümmi" bir insanın təbliğ etdiyi kitabın bütün dövrlərdən bəhs etməsi və dünyanın ən çox oxunan müqəddəs kitabı olması

254. Ayni, *Umdətul-Qari*, Beyrut, 2001, XVII, s.351.

255. Əbu Yala, *Müsnəd*, III, s.261.

256. əl-Kəşmiri, *Feyzul-bari*, Dipnot: 1, Beyrut, 2005, V, s.97.

257. Ənkəbut, 29/48.

həqiqətən böyük tarixi hadisədir. Rəsulullahın “ümmi” olduğunu inkar edənlər bu böyük tarixi hadisəni görməzlikdən gəlirlər.

Siyər kitablarında Allah Rəsulunun həyatı haqqında ətraflı məlumat var. Ancaq heç bir mənbədə Onun oxuma-yazma bildiyi haqqında bir ipucu yoxdur. Bir anlıq Onun möcüzəvi şəkildə oxuya bildiyini düşünsək belə, oxuma bildiyi haqqında heç bir rəvayətin olmaması bu xəyali fərziyyənin əsassız olduğunu göstərir.

“Ümmilik” oxuma-yazma bilməyin antonimidir. Alim sözünün antonimi isə “cahil” sözüdür. Kor insan alim ola bilər. “Ümmi” də alim ola bilər. İnsanlar üçün keçərli olan bu qayda, peyğəmbərlər üçün də keçərlidir. Bu isə o deməkdir ki, “ümmilik” nöqsan sayıla bilməz. Allah Rəsulunun “ümmiliyi” də Onun peyğəmbərliyinin ən böyük dəlillərindən biridir.

Bütün – dil, təfsir, hədis və s. – alimləri “ümmi” sözünün oxuma-yazma bilməyən olduğunu demişlər. Onların dedikləri həqiqətdir. “Məalçılar” “ümmi” sözünə müxtəlif mənalar və izahlar verməyə çalışır. Halbuki onların bu izahlarını heç bir elmi əsası yoxdur.

* * *

# “MƏALÇILAR” HEÇ QURAN OXUYURMU?

### “Mühasirə”

“Məalçılar”ın qəbul etmədiyi mövzuların demək olar ki, hamısı Rəsulullaha qarşı yönəlmiş tənqid və təhdidlərdir. Onlar Allah Rəsulunun etibarını zədələməyə çalışırlar. “Ümmiliyi” inkar etmək, bir mənada Quranın başqa kitablardan köçürüldüyünü qəbul etməkdir. Rəsulullahın məsum olduğunu inkar etmək isə, Onun günahkar olduğu və buna görə də Ona itaətin vacib olmadığı mənasına gəlir. “Məalçılar” da hədislər haqqında şübhələr ortaya ataraq “Peyğəmbərsiz İslama” yol açır, möcüzələri inkar etməklə isə, peyğəmbərliyin dəlillərini inkar edirlər. Onların məqsədi İslamı təhrif etməkdir.

### “Quranilərin” möcüzə anlayışı

“Məalçılara” görə, Rəsulullahın Qurandan başqa möcüzəsi yoxdur. Hədis kitablarında ayın yarılması kimi möcüzələr olsa da, bəzi alimlər bunları Quranla sübut etməyə çalışsa da nəticə dəyişmir. Onlar “inşiqaqı-qamər” ayın yarılması hadisəsinin keçmişdə yox Qiyamət qoparkən baş verəcəyini deyirlər. Onlara görə, ayələrdə hadisənin Rəsulullahla əlaqəsi olduğunu göstərən açıq və ya qapalı heç bir ipucu yoxdur.[258] “Məalçılar” iddialarını belə əsas-

258. İxtisarla tərcümə: əl-Hafiz Muhamməd Əsləm, Talimatul-Quran, Delhi, 1934, 150; Nükətul- Quran, Delhi, 1952, 168; Hadim Hüseyin İlahi Bahş, əl-Quraniyyun, Məktəbətus-Sıddıq, 308-313.

landırırlar: "Allah bir peyğəmbərə möcüzə verər, ətrafındakılar buna rəğmən ona inanmazsa Allah onları həlak edər. Necə ki, Hz. Saleh və Hz. Musa kimi bir çox peyğəmbərin qövmü möcüzəni inkar edəndən sonra həlak edilmişdir. Əgər Rəsulullahın möcüzələrindən "inşiqaqı-qamər" - ayın yarılması həqiqət olsaydı Qureyş həlak olmalı idi. Mənbələrdə Qureyşin həlak olduğunu göstərən məlumat yoxdur. Bu isə o deməkdir ki, həmin hadisə olmayıb. Qəmər surəsində ayın yarılmasından bəhs olunur. Həmin hadisə Qiyamət günü olacaq. Möcüzə olaraq nəql edilən rəvayətlər isə uydurmadır."

### Möcüzələr

Möcüzə peyğəmbərliyini sübut üçün Allah tərəfindən peyğəmbərlərə verilən İlahi sənəd hökmündədir. Möcüzələrə inanmaq vacibdir. İnkar etmək isə, peyğəmbərlərin əlindəki İlahi "şəhadətnamələri" tanımamaqdır.

Möcüzələr ağıla yox, insanın öyrəndiyi biliklərə və nizama ziddir. Kainatı yoxdan yaradan, çəyirdəkdən böyük ağaclar ucaldan Allah hər şeyə qadirdir. İstəsə öldürər, istəsə balığın qarnında, alovun içində dirildər. Allahın kainatda yaratdıqlarını dərk edən ağıl, peyğəmbərlərə verdiyi möcüzələri idrak etməkdə çətinlik çəkməz.

### Quranın ecaz xəritəsi

Rəsulullahın ən böyük möcüzəsi bütün dövrlərə xitab edən Qurandır. Quranın möcüzəvi yönləri bunlardır:

1. Quranda həm insanların unutduğu, həm də gələcəkdə baş verəcək hadisələrdən məlumat verilmişdir. Əhli-kitabdan olan bizanslıların (rumlar), müşrik məcusilərlə 10 il sonra döyüşəcəyi və Əhli-kitabın qalib gələcəyi,[259] Məkkədə nazil olan bir ayədə müş-

259. Rum, 30/3-4.

riklərin məğlub olacağı[260] buna misal göstərilə bilər. Quranda deyilənlər eynilə baş vermiş, məcusilər məğlub olmuşdur. Məkkəlilər Bədirdən qaçmışdır. Allahın xəbər verdikləri eynilə gerçəkləşmişdir.

2. Hələ son dövrlər kəşf olunan bəzi elmi yeniliklər Quranda on dörd əsr əvvəl xəbər verilmişdir. İki dənizin suyunun bir-birinə qarışmadığı,[261] hər şeyin cüt yaradıldığı,[262]bəzi bitkilərin küləklə tozlandığı,[263] yer və göyün bitişik olduğu, sonra bir-birindən ayrıldığı, hər şeyin sudan yaradıldığı[264] kimi hadisələr elmə son dövrlərdə məlum olmuşdur.

3. Quran bəlağət və fəsahətdə mahir olan ərəbləri təəccübləndirdi. İnkar edənlərə əvvəlcə bənzərini,[265] sonra on surəsini,[266] axırda da bir surəsinin oxşarını gətirin deyə açıq-aşkar meydan oxuyurdu. Ən böyük şairlər belə Quran qarşısında acizliyini etiraf etmişdir. Bəzisi iman gətirmiş, bəzisi gətirməmişdir. Quran onlara açıq-aşkar meydan oxuyurdu. Heç Quranın bənzərini gətirə bilməmişdir.

4. Quranın hüquqi yönü də möcüzədir. Yol kəsməyin[267] və oğurluğun cəzası[268] bildirilən iki ayənin arasında təqva haqqında ayə[269] var. Bu da onu göstərir ki, hər iki cəzanın qarşısını ancaq təqva ilə almaq mümkündür. Ərəbistan yarımadasında o dövrdə

260. Qamer, 54/45.
261. Rəhman, 55/19-20.
262. Zariyət, 51/49.
263. Hicr, 15/22.
264. Ənbiya, 21/30.
265. İsra, 17/88.
266. Hud,11/13.
267. Maidə, 5/33.
268. Maidə, 5/37.
269. Maidə, 5/35.

təhlükəsizlik demək olar ki, yox idi. Ancaq Quran nazil olandan sonra ora ən təhlükəsiz bölgəyə çevrildi.

1930-cu il ABŞ-da içkini qadağan edən qanun qəbul olundu. Ancaq içki istehsalı daha da artdı. Qanunun heç bir təsiri olmadığını görən dövlət qadağanı qaldırdı. Quranda içki üç mərhələdə qadağan olundu. Üçüncü mərhələdə **"Artıq bu işə son qoyacaqsınızmı?"**[270] əmrini eşidən möminlər şərab küplərini küçələrə boşaltdılar. Mədinə küçələrində şərabın sel kimi axdığı bildirilir.

Quran ərəblərin məşhur ədib və şairlərinə meydan oxumuşdur. Müşriklər Quran qarşısında aciz qalmış, axırda qılınclarını qurşanıb Mədinəyə yürümüşlər. Bədir, Uhud və Xəndək əslində müşriklərin söz ilə olan məğlubiyyəti qələbəyə çevirmək cəhdləri idi.

## Digər möcüzələr

Rəsulullahın Quran xaricində bir çox möcüzəsi vardır. Həmin möcüzələrdən bəzisi Quranda, bəzisi də hədis kitablarındadır. Ayın ikiyə yarılması, cansız varlıqların Ona salam verməsi, xurma kötüyünün ayrılığa dözməyib ağlaması, yemək və suyun Onun bərəkəti ilə çoxalması, oxuduğu və ya toxunduğu xəstələrin şəfa tapması, barmaqlarından suyun axması və s. möcüzələrdən bəhs olunan əsərlərdə möcüzələr iki başlıqda toplanmışdır. Bir qrupa Quranda keçən, digər qrupa isə Rəsulullahın göstərdiyi möcüzələr daxil edilmişdir. Son dövrlərdə yazılan kitablarda isə, Rəsulullahın göstərdiyi möcüzələr və gələcəyə dair verdiyi xəbərlər "Nübuatur-rəsul" başlığı altında toplanmışdır.[271]

## Möcüzə möminlər üçün nədir?

Təəssüflər olsun ki, "müasir müsəlmanlar" pozitivizmin təsirində qalaraq möcüzəni izah edə bilməmişlər. Onlar ya möcüzəni

---

270. Maidə, 5/91.

271. Muhamməd Vəliyyullah ən-Nədvi, *Nubuatur-rasul mə təhaqqaqə minhə vaməyətəhəqqəqu*, Darus-Salam, Qahire, 1990.

inkar etmiş, ya da möcüzənin müsəlman üçün: "Ən çətin şərtlərdə belə çıxış yolu var. Səbr et! Küfrə təslim olma. Hz. İbrahimi odda yandırmayan Allah, səni də qoruyar." deyərək qəbul etməmişlər. Bu cür düşünənlərdən biri Misirli Fərid Vəcdidir. O, "Elm və fəlsəfə işığında Allah Rəsulunun həyatı" adlı silsilə məqalələrində möcüzəni adiləşdirmişdir. Muhamməd Abduh "Fil" surəsinin təfsirində Əbabil möcüzəsini müəyyən təvillərlə rədd etmiş, Hüseyn Heykel isə, "Həyatı-Muhamməd" adlı kitabında qərbin elm anlayışını mənimsədiyini bildirmişdir. Mustafa Mərağı həmin əsərə yazdığı ön sözdə "Rəsulullahın yeganə möcüzəsinin Quran olduğunu, onun da ağıl tərəzisində çəkildiyini" qeyd etmişdir.[272]

Əzhər universitetinin də mənimsədiyi müasir elm "məntiqi" hər gün artaraq yayılmaqdadır. Bu düşüncə müsəlmanların yaşadığı ən ucqar yerlərə qədər gedib çıxıb. Nəticədə möcüzə sayılan bir çox şey inkar edilməkdədir. Müsəlmanlar möcüzəyə inamı itirməklə Nəmrudlara qarşı İbrahim kimi mübarizə aparmaq əzmini də itirmişlər.

### Möcüzə ilə əlaqəli əsərlər

Tarix boyu Rəsulullahın peyğəmbərliyini inkar edənlər olmuşdur. Onlara qarşı əsərlər yazılmışdır. Bəzi alimlər risaləti möcüzələrlə isbat etməyə çalışmış və bu mövzuda əsərlər qələmə almışlar. Bu mövzuda yazılan əsərlərə "Dəlailun-nübüvvə" və ya "Aləmin-nübüvvə" deyilir. Həmin əsərlərin ən məşhuru Əbu Nuaym əl-İsfəhaninin (ö. 430/1038) "Dəlail" və Əbu Bəkir əl-Beyhaqinin (ö.458/1066) "Dəlail" əsərləridir. İmam Süyutinin "əl-Xasaisul-Kübra" əsəri kimi əsərlərdə həm Allah Rəsulunun peyğəmbərlikdən əvvəlki həyatı haqqındakı "irxasat" rəvayətləri, həm də risalətdən sonrakı "möcüzə" adlanan qeyri-adi hadisələri ehtiva edir.

"Məalçılar" hədisləri dəlil olaraq qəbul etmirlər. Buna görə də, bu yazıda möcüzələri hədislərlə izah edən "Dəlail" kitablarını yox,

272. www.ihsansenocak.com/mukaddime-4/

ayələrdə xəbər verilən hadisələri əsas götürəcəyik. Qəribədir ki, xristianlar Hz. İsanın möcüzələrinə istinad edərək Onu ilahlaşdırır. "Məalçılar" isə, peyğəmbərlərinin risalətinə dəlil olan möcüzələri inkar etməyə çalışırlar. [273]

## Təhrif

"Məalçılar" Rəsulullaha Qurandan başqa möcüzə verilmədiyini iddia edir, möcüzə haqqındakı ayələrə fasid təvillər gətirirlər. Onlar İsra yolçuluğunun Məscidi-haramdan Məscidi-əqsaya deyil, Məscidi-həramdan Ciranədəki məscidə edildiyini, mələklərin gəlişinin "mənəvi dəstək" olduğunu, ayın Qiyamət əlaməti olaraq yarılacağını bildirirlər.

Qurana ümumi prinsiplər nöqteyi-nəzərindən baxa bilmədiklərinə görə, ayələrdəki İlahi muradı anlamır, əqidə məsələlərində xətaya düşür və nəticədə bir çox məsələni inkar edirlər. "Məalçılar" kafirlərlə əlaqəli ayələri müsəlmanlara da aid edir, kafirlər[274] və möminlər[275] üçün hökmü fərqli olan şəfaət ayələrini təhrif və inkar edirlər.

Qurandakı kafirlər və möminlər haqqındakı ayələrin eyni olduğu ehtimalından söhbət gedə bilməz. Bu, hökmləri bir-birinə qarışdırmaq və Quranı açıq-aşkar təhrif etmək cəhdidir. "Quran müsəlmanları" da şəfaət və möcüzə kimi mövzularda məhz bu cür təhriflər edirlər.

## Quranda möcüzələr

"Məalçı", "kafirlərə şəfaətin fayda verməyəcəyini" bildirən ayələrin möminlərə də aid olduğunu deyirsə, deməli ya şəfaəti

273. Mustafa Sabri, *Mövqiful-əqli vəl ilmi vəl aləm*, Darut-tərbiyə, Dəməşq, 2007, IV, 88.

274. Müddəssir, 74/48.

275. Ta-Ha, 20/109.

inkar edir, ya da Quranda təzad olduğunu göstərməyə çalışır. "Məalçılar" möcüzə haqqında da eyni "məntiqlə" hərəkət edir və deyirlər ki, İsra surəsinin 59-cu ayəsi Rəsulullaha möcüzə verilmədiyini göstərir. Bu fikir, Quranda təzadın olduğu mənasına gəlir. Bəs möcüzə haqqındakı digər ayələri necə başa düşək?

Şəfaətlə əlaqəli ayələrə kafirlər və möminlər üçün iki fərqli başlıqda nəzər salmaq lazımdır. Şəfaət kafirlər üçün caiz olmadığı halda, möminlər üçün haqdır. Möcüzələrlə əlaqəli ayələrə də bu cür yanaşılmalıdır. Bəzi möcüzələrə "əl-möcüzətul-mulhiqə" yəni "inanmayıb fitnə çıxaranları həlak edən möcüzələr" demək olar. Çünki insanlar həmin möcüzələri əvvəlcə qəbul etmədilər. Sonra da inkar edərək fitnə-fəsad çıxardılar və nəticədə həlak oldular. Bəzi möcüzələrə də, "əl-mucizətul-murşidə" yəni "yol göstərən möcüzələr" deyə bilərik. Həmin möcüzələr nəticəsində bir çox insan iman etmiş, inananların da imanı güclənmişdir. Bəzi insanlar bu möcüzələri də inkar etmişlər. Ancaq həmin inkar fitnəyə və həlaka səbəb olmamışdır.

### Məkkəlilər nə üçün möcüzə istəyirdi?

Məkkə müşrikləri Peyğəmbərimizdən möcüzə olaraq yerdən su çıxarmasını, qızıldan evinin olmasını və ya göyə yüksəlməsini[276] istəyirdilər. Uca Allah onların bu istəyini, nəticəsi inkar və fitnəyə səbəb olacağı üçün qəbul etməmişdir. Necə ki, bu ayələr[277] kafirlərin səmimi istəyinə yox, istehzalarına cavab olaraq endirilmişdi. Müşriklər Rəsulullahı məsxərəyə və lağa qoymaq üçün bu cür tələblər irəli sürürdülər. Həmin ayələrdən əvvəlki və sonrakı ayələrə (siyaq və sibaq) nəzər saldıqda görürük ki, əslində onlar bir insanın peyğəmbər olmasını gözləmir və bunu inkar edirdilər. Əvəzində mələyin peyğəmbər olmasını gözləyirdilər. Uca Allah onların bu bəsirət korluğu haqqında belə buyurur: **"Əgər onlara göydən bir qapı açsaq (nərdivan endirsək) və onunla**

276. İsra, 17/90,95.

277. İsra, 17/90, 95.

**durmadan yuxarı dırmaşsalar (göydə Allahın qüdrətini və əzəmətini görsələr) yenə də (inanmayıb): "Gözümüz bağlanmış (xumarlanmış), biz sehrlənmişik (Muhəmməd bizi ovsunlayıb gözümüzü bağlamışdır)", – deyərlər."**[278]

### "Məalçılar" niyə Qurandan bu qədər bixəbərdir?

Sünnəni inkar edən "Məalçılar" Qurana bütöv nəzərlə baxa bilmirlər. Onlar bu ayəni ilahiyyat fakültəsində oxuyan bir tələbə nəzəri ilə oxuya bilsəydilər, ayənin möcüzələrə dəlil olduğunu görərdilər. *"Bizə möcüzələr göndərməyə mane olan şey ancaq əvvəlkilərin (keçmiş ümmətlərin) onları yalan hesab etmələridir. Biz Səmud tayfasına açıq-aşkar bir möcüzə olaraq dişi (maya) bir dəvə verdik, lakin onlar ona zülm etdilər (dəvəni tutub kəsdilər). Biz möcüzələri yalnız (bəndələrimizi) qorxutmaq üçün göndəririk."*[279]

Bu ayə müşriklərin istədiyi möcüzələrin niyə göstərilmədiyinə dəlildir. Ayədə Səmud qövmünün timsalında əvvəlkilərin möcüzələri yalan hesab etməsi bildirilmişdir. Səmud qövmü möcüzəyə inanmamaqla iki cinayət işləmişdi. Birincisi"فَظَلَمُوابِهَا/ "möcüzəyə inanmayaraq özlərinə zülm etdilər. "İkincisi isə"فَكَذَّبُوهُفَعَقَرُوهَا / **"Lakin onlar (Salehi) yalançı saydılar və onu (dəvəni) tutub kəsdilər."**[280]Səmud qövmü Saleh peyğəmbərdən möcüzə istəmişdi. İstədikləri oldu. Onlar həmin möcüzəni inkar etdilər. Sonra da möcüzə olaraq yaradılan dəvəni kəsdilər. Onlar dəvəni inkar edəndən sonra yox, kəsəndən sonra həlak oldular. "Məalçılar" isə möcüzəni inkar edən qövmlərin dərhal həlak edildiyini iddia edirlər. Ancaq bu, belə deyil. Yuxarıdakı ayə onların bu iddiasının əsassız olduğunu göstərən dəlillərdən biridir.

Quranda peyğəmbərlərin möcüzələrini inkar edən qövmlərin illər sonra həlak edildiyi bildirilir. Bu məqalədə "Quran müsəlman-

278. Hicr, 15/14-15.

279. İsra, 17/59.

280. Şəms, 91/14.

lığı” pərdəsi altında gizlənənlərin Qurandan nə qədər bixəbər olması və eyni iddiaları necə təkrar etməsinə toxunulmuşdur. Danışıqlarından görünür ki, onlar, “Quran müsəlmanlarının” fikirlərini mənbəyini bilmədən nəql edir. Onlar iddia edir ki: “İnşiqaqı-qamər hadisəsi iki yüz il sonra uydurulan yalandır. Ayənin ayın bölünməsi ilə heç bir əlaqəsi yoxdur. Keçmiş zaman felinin işlədilməsi həmin hadisənin gələcəkdə olacağına mane deyil. Qiyamətlə əlaqəli bütün fellər keçmiş zamanda işlədilmişdir. Ay yarılıb deyə bir nəfər iman etdimi? Qurandakı möcüzələrdən məlumdur ki, bir qövm imana dəvət olunur. Sonra möcüzə tələb edir. Onlara möcüzə göstərilir. İman etmədikdə də həlak edilir. Qurandakı möcüzələr belə cərəyan edib. Məhz buna görə, Allah Peyğəmbərə Qurandan başqa möcüzə verməyib. Rəsulullaha verilən yeganə möcüzə Qurandır. İsra surəsinin 59-cu ayəsində də bu bildirilmişdir. Ənkəbut surəsinin 51-ci ayəsi də bu haqdadır: **“Məgər (müşriklər) oxunmaqda olan Kitabı sənə nazil etməyimiz onlara kifayət etmədimi? ”** Ayələr təhrif edilərək iki yüz il sonra bu yalan uydurulmuşdur.”[281]

### Ay yarılıb yoxsa yarılacaq?

Uca Allah “inşiqaqı-qamər” hadisəsini “ay (peyğəmbərin möcüzəsi ilə) parçalandı.”[282] şəklində keçmiş zamanda “إِنْشَقَّ” (inşəqqa) feli ilə xəbər verir. Keçmiş zaman gələcəyə aid deyil, keçmişdəki hadisəni xəbər verir. Yəni fel hansı zamanda işlədilibsə, deməli, hadisə də həmin vaxt baş verib. Fel keçmiş zamandadırsa, hadisə keçmişdə, indiki zamandadırsa hal-hazırda, gələcək zamandadırsa gələcəkdə baş verəcək. Bu səbəbdən bir insan ərəb dilində “خَرَجَ مُحَمَّدٌ وَمَاتَ أَحْمَدُ” dedikdə“Muhamməd çıxdı, Əhməd öldü” başa düşülür.

281. Hər cümləsinə ayrıca rəddiyyə yazılacaq xütbənin sözügedən hissəsinə bu linkdən baxa bilərsiniz: https://www.youtube.com/watch?v=LOb-Dx2Q9UNM

282. Qəmər, 54/1.

*"Həqiqətən, Biz Nuhu öz tayfasına peyğəmbər göndərdik..."*[283]ayəsindəki "أَرْسَلْنَا" feli keçmiş zamandadır. Bu Hz. Nuhun gələcəkdə yox keçmişdə göndərildiyini bildirir. Əgər keçmiş zaman feli ilə gələcək zamanın nəzərdən tutulduğu iddia edilirsə, bunu sübut etmək lazımdır. Onların "إِنْشَقَّ /yarıldı" felinin gələcəyə aid olduğunu iddia etməsinin, buna dəlil olaraq Təkvir surəsində günəşin büküləcəyi, ulduzların səpələnəcəyi hadisəsinin keçmiş zamanda işlədildiyini göstərməsinin, "إِذَا"dən istifadəsinə rəğmən "إِذَا"siz fellə "إِذَا"li felə eyni mənanı verməsinin iki səbəbi ola bilər: ya onlar həqiqətən cəhalətlərindən bunları bilmir, ya da bildiyi halda həqiqəti inkar edirlər. Təkvir surəsndəki ayələrdə "إِذَا" zaman zərfidir və hadisələrin gələcəkdə olacağını bildirir.[284] Nəhl surəsinin "أَتَىٰٓ أَمْرُ اللّٰهِ" ifadəsi ilə başlayan ayəsində, "أَتَىٰ" feli keçmiş zamandadır. Ancaq mənası "Allahın əmri gəldi." şəklinde deyil, "Allahın əmri olacaqdır." şəklindədir. Bu da dediyimizi sübut edir. Çünki felin həqiqi mənada başa düşülməsinə mane olan zərf var ki, o da "فَلَا تَسْتَعْجِلُوهُ/ Bir an əvvəl gəlməyini istəməyin" ifadəsidir. Keçmiş zamanda olduğu halda zərflərlə gələcək və indiki zaman mənasında işlənən bir çox fel var.

Bir ayəni həqiqi mənada başa düşmək mümkün olmadıqda məcazi mənalarına müraciət etmək lazımdır. Ayın yarılması haqqında Qəmər surəsinin ikinci ayəsində buyurulur: **"Əgər müşriklər (Muhəmməd əleyhissəlamın peyğəmbərliyinin həqiqiliyini təsdiq edən) bir möcüzə görsələr, (imandan) üz döndərib: "(Bu, uzun müddət) davam edən bir sehrdir!"** – deyərlər."[285] Ayədə Rəsulullahın ayı iki yerə parçalamaqla düşmənlərinə peyğəmbərliyinə dair göstərdiyi möcüzəni onların inkar etdiyi və uzun müddət davam edən sehr adlandırdığı bildirilir. Əgər ay parçalanmamış olsaydı, onlar Rəsulullahın göstərdiyi hansı möcüzəni inkar edəcəkdilər? Deməli, Allah Rəsulu peyğəmbərliyinin dəlili olaraq onlara Ayın yarılması möcüzəsini göstərmişdi. Son-

283. Hud, 11/25.

284. İbn Hişam, *Muğnil-ləbib*, Daru ihyait-turasil-arabi, I, 92-93.

285. Qəmər, 54/2.

rakı ayə onların Rəsulullahı təkzib etdiyini göstərir: **"Onlar (ayın parçalanmasını və Peyğəmbər əleyhissəlamı) təkzib etdilər və öz nəfslərinin istəklərinə uydular..."**[286] Təkzib etdilər ifadəsi gələcəkdə olacaq hadisə haqqında yox, baş vermiş hadisə haqqındadır. Həmin hadisə də Allah Rəsulunun möcüzəsi olaraq ayın iki yerə bölünməsidir.

Bəziləri ayədə Ayın bölünməsini "Qiyamət yaxınlaşdı"[287] cümləsi ilə əlaqələndirirək: "Quranın nazil olmasından 14 əsr keçdiyinə görə bu hadisə Qiyamət əlaməti olaraq baş verəcək" -deyir. Allah Rəsulu məhz bu cür düşünən insanlara xitabən belə buyurmuşdur: *"Mən Qiyamətə iki barmaq arası qədər – çox qısa məsafə qalanda peyğəmbər göndərilmişəm"*.[288] Peyğəmbərimiz şəhadət barmağı ilə orta barmağını birləşdirərək Qiyamətə çox az müddət qalarkən göndərildiyini bildirmişdir. Allah, ayələrini insanlara çatdırmaq vəzifəsini seçkil elçilərinə - peyğəmbərlərə həvalə etmişdir. Rəsulullah da son peyğəmbərdir. Allahın ayələrini öz ağlına görə izah edərək Rəsulullahı inkar edənlər əslində vəhyi inkar edirlər. Onların yanaşma tərzi vəhyə tamamilə ziddir. Uca Allah Qiyamət haqqında müşriklərə xitabən belə buyurur: **"Şübhəsiz ki, onlar (müşriklər) onu (o əzabı) uzaq görürlər (ona inanmırlar). Biz isə onu yaxın görürük (ona inanırıq)."**[289]

### Möcüzə iki yüz il sonra məlum oldu?

"Məalçılar" deyir ki, Ayın yarılması möcüzəsi iki yüz il sonra uydurulmuşdur. Onun bu sözləri yalan və iftiradır. Quranı təhrif etmək cəhdidir. Ayın parçalanması Quranda xəbər verilir. Quran isə Rəsulullaha nazil olan son səmavi kitabdır. Abdullah ibn

286. Qəmər, 54/3.

287. Qəmər, 54/1.

288. Buxari, H. No: 60504; Müslim, H. No: 7270.

289. Məaric, 70/6-7.

Məsud[290], Abdullah ibn Abbas,[291] Ənəs ibn Malik,[292] Cübeyr ibn Mutim,[293] Abdullah ibn Ömər[294] başda olmaqla bir çox səhabə Ayın yarılması möcüzəsini təsdiqləmiş, Ümmət bu haqda icma etmişdir. Kəttani "Nazmul-mütənasir" adlı əsərində Ayın yarılması haqqındakı hədislərin mütəvatir olduğunu bildirir.[295] Yəni bütün mənbələr bu möcüzənin həqiqətən olduğunu göstərir. Görəsən, "inşiqaqı-qamər iki yüz il sonra uydurulan yalandır" sözündən böyük yalan var?

Buxari və Müslim başda olmaqla Sünən və Müsnəd tərzində yazılan hədis kitablarında açıq-aşkar "inşiqaqı-qamər" möcüzəsinin olduğu bildirilmişdir.[296]

"Məalçılar" iddia edir ki, həmin möcüzəni görüb iman edən bir nəfər belə olmayıb. Bunu qeyd edim ki, bu haqda nəql olunan məlumata rast gəlmədim. "Məalçıların" "məntiqinə" görə də, müşriklər bu möcüzəyə inanmayacaqdılar. Ayədə də bildirilir ki, onlar bunu təkzib edir və möcüzəyə sehr deyirdilər.[297] Onlar insanların İslamı qəbul etməyinə mane olmaq üçün, Peyğəmbəri sehrbaz, möcüzələri də sehr adlandırırdılar. "Sehrbaz peyğəmbər ola bilməz", deyərək insanları öz yalanlarına inandırmağa çalışırdılar. Bu səbəbdən onların bu möcüzə ilə iman etməsini düşünmək absurddur. Onlar iman etməli idilər deyə düşünən insan, deməli, Quran həqiqətlərindən bixəbərdir.

290. Buxari, H. No: 4864.
291. Buxari, H. No: 4868.
292. Buxari, H. No: 4866.
293. Tirmizi, H. No: 3507.
294. Hakim, Müstədrək, H. No: 3759.
295. Muhammed ibn Cəfər, əl-Kəttani, *Nazmul-mütənasir minəl-hədisil-mütəvatir*, Darul-qutubis-selefiyye, Misir, I, 211-2.
296. İbn Həcər, Fəthul-bari, VIII, 617; Nəvəvi, Minhacus-sünnə, XVII, 143.
297. Qəmər, 54/2.

**Ey məalçı! Hansı Quran?**

"Qurandakı möcüzələrdən məlumdur ki, bir qövm imana dəvət olunur. Sonra möcüzə tələb edir. Onlara möcüzə göstərilir. İman etmədikdə də həlak edilir. Qurandakı möcüzələr belə cərəyan edib. Məhz buna görə Allah Peyğəmbərə Qurandan başqa möcüzə verməyib. Rəsulullaha verilən yeganə möcüzə Qurandır. İsra surəsinin 59-cu ayəsində də bu bildirilmişdir."

Bu ifadələrin sahibi, özünə "Quran müsəlmanı" dediyi halda, Qurandan nə qədər bixəbər olduğunu göstərir. Yuxarıda Səmud qövmü haqqında izah edildiyi kimi, Quran qissələrinə ümumi mənada baxmaq lazımdır. Bu cür yanaşanda görürük ki, qövmlərin həlakı istədikləri möcüzəni inkar edəndə deyil, fitnə-fəsad çıxaranda, yolunu azanda, peyğəmbərləri onlardan ümidini kəsəndə baş verib. Məsələn, Hz. Nuh 950 il yaşamışdır. Qövmünə bir çox möcüzələr göstərmiş, onlar da inkar etmişlər. Ancaq Allah onları möcüzələri inkar edəndə həlak etməmişdir. Hz. Nuh onların iman edəcəyindən ümidini kəsib: **"Ey Rəbbim! Yer üzündə bir nəfər belə kafir qoyma!"**[298] deyə dua edəndən sonra qövmü suda boğularaq həlak olmuşdur.

Quran bunu deyir:

Firon Hz. Musaya: **"Əgər möcüzə ilə gəlmisənsə və doğru deyirsənsə, onu gətir göstər!"**[299] - demişdi. Hz. Musa əlindəki əsanı yerə atdı. Əsa əjdahaya çevrildi. Əlini qoltuğunun altından çıxardı. Baxanlara nur kəsildi.[300] Firon və əyanları bu möcüzələrin hamısını öz gözləri ilə gördü. Ancaq iman etmədilər. Hz. Musanın möcüzələrinə qarşı hər tərəfə adamlar göndərərək sehrbazlar çağırtdırdı. Guya sehrbazlar möcüzələrə sehrlə qalib gələcəkdilər. Allah Hz. Musaya yenə əsanı yerə atmasını əmr etdi. Əsa sehrbazların etdiklərini uddu. Bunu görən

298. Nuh, 71/26.

299. Əraf, 7/106.

300. Əraf, 7/107-8.

sehrbazlar səcdəyə qapanaraq: *"Biz iman gətirdik aləmlərin Rəbbinə! Musanın və Harunun Rəbbinə!"* – dedilər. Firon onları əl-ayaqlarını çarpaz kəsdirməklə hədələdi. Ancaq onlar yenə də imanlarından dönmədilər. Şəhid olmazdan əvvəl: **"Şübhə yoxdur ki, biz Rəbbimizin hüzuruna dönəcəyik! (Bizi ölümlə qorxuda bilməzsən!)"**[301] dedilər.

Əyan-əşrafı Firondan Hz. Musa və tayfasını cəzalandırmağı istədikdə, Firon onlara belə cavab verdi: *"Biz onların oğullarını öldürəcək, qadınlarını isə (bizə xidmət etmək üçün) diri saxlayacağıq. Biz onlara, mütləq, qələbə çalacağıq!"*[302] Hz. Musa başlarına gələn bu müsibət haqqında tayfasına, "Allahdan kömək diləyin və səbr edin. Yer üzü Allahındır. Bəndələrindən istədiyini onun varisi edər. Aqibət (dünyada zəfər, axirətdə yüksək məqamlar) müttəqilərindir!" – dedi.[303] Sonra Allah Firon və əyanlarını quraqlıq və qıtlıqla cəzalandırdı. Onları müxtəlif şəkillərdə sınağa çəkdi. Ancaq yenə də iman etmədilər.[304] Hz. Musanın göstərdiyi möcüzələrin üzərindən xeyli vaxt keçəndən sonra Allah Firon və ordusundan intiqam alaraq onları Qırmızı dənizdə batırdı.[305]

## Üç ehtimal

Allah Hz. Musanın möcüzələrini inkar edən Fironu dərhal deyil, bir müddət sonra həlak etmişdir. "Məalçılar" isə, bunun əksini iddia edərək qövmlərin möcüzəni inkar etdiyi an məhv edildiyini bildirir. Hz. Musa Fironu haqqa dəvət etdikcə Firon yolundan azmağa başladı. O yolundan azdıqca fitnə-fəsad çoxaldı. Hz. Musa şəhərdən çıxmaq məcburiyyətində qaldı. Firon ondan əl çəkməyib təqib elədi. Dağları təpələri aşaraq onun ardınca gəldi və axır-

301. Bax:Əraf, 7/106-125.

302. Əraf, 7/127.

303. Əraf, 7/128.

304. Əraf, 7/133.

305. Əraf, 7/136.

da əsa ilə yarılan dənizdə boğuldu. Əgər Quranda onların dediyi kimi olsaydı, yəni inanmayan qövm həmin anda cəzalandırılsaydı, onda Firon illər sonra yox, dərhal ölməli idi. Quran Fironun illər sonra boğulduğunu bildirir. Hz. Musa və Firon arasında baş verən bu hadisə Quranda ətraflı izah edilir. Onda belə çıxır ki, bunların Quranda üç səhifə yer tutan bu hadisədən xəbəri yoxdur. Və ya ehtimal ki, onlar:

1. Quran oxumur.
2. Quran oxuyur, ancaq anlamır.
3. Anlayır ancaq Quranı təhrif edir.

Quranı inkar edən məkkəlilər niyə həlak olmadı?

"Məalçıların" möcüzəyə inanmayanların həlakı və Peyğəmbərimizin yeganə möcüzəsinin Quran olması iddiası təzadlarla doludur. Məlumdur ki, "inşiqaqı-qamər" möcüzəsinə inanmayan müşriklər Qurana da inanmırdılar. Onların iddiasına görə, müşriklər həlak olmalı idi. Ancaq Məkkədə belə bir hadisə baş vermədi. Bu da onu göstərir ki, onların Qurandan xəbərsizdir. Həmişə nifaq toxumları səpməsi və təkfir əhlinin üslubundan istifadəsi də onların acizliyindən xəbər verir.

## Möcüzə Sünnətullaha ziddir yoxsa Sünnətullahdır?

Allahın kainatda müəyyən etdiyi qayda-qanunlara Sünnətullah deyilir. "Məalçılar" Ayın parçalanması möcüzəsinin Sünnətullaha zidd olduğunu, Sünnətullahın dəyişməyəcəyini iddia edirlər. Bu iddia əsassızdır. Onlar bu iddialarında yanılırlar. Çünki Allahın peyğəmbərlərinə lütf etdiyi möcüzələr Sünnətullahdır. Atəşin Hz. İbrahimi yandırmaması, Hz. Musanın əsa ilə dənizi ikiyə bölməsi, Hz. İsanın ölüləri diriltməsi Sünnətullah çərçivəsində normal bir hadisədir. Ayın yarılması da bunun kimidir. Hz. İsanın atasız dünyaya gəlməsini Sünnətullahdan sayanlar, Rəsulullahın möcüzələrinə gələndə qəbul edə bilmirlər.

## Həmin möcüzəni niyə heç kim görməyib?

Ateistlər Ayın yarılması möcüzəsini inkar edərək: "Əgər belə bir hadisə olsaydı müxtəlif bölgələrdəki insanlar bunu görər və bu hadisə bizə nəql olunardı", - deyirlər. Onların bu iddiası belə bir hadisənin olmadığına dəlil sayılmır. Çünki bu hadisə gecə vaxtı, insanlar evlərində olarkən baş vermişdir. Bu səbəbdən həmin möcüzəni görənlərin sayı çox deyil.[306] Üstəlik belə bir möcüzənin hamı tərəfindən görülməsi Sünnətullaha zidd olardı. Əgər bu möcüzə hər tərəfdə görülsəydi, qeybə imanın bir mənası qalmazdı.

Ay hər gecə müxtəlif saatlarda çıxır. Üstəlik dünyanın bir tərəfində gecə olanda, digər tərəfində gündüz olur. Həmin möcüzə baş verəndə çox insan Rəsulullahın peyğəmbər olduğunu bilmirdi. Bu səbəbdən həmin hadisəni görən insanların bunu ay tutulmasına bənzətmək ehtimalı da var.

Bəzi hind tarixçiləri "inşiqaqı-qamər" möcüzəsini Hindistanda gecə yarısı görənlərin olduğunu qeyd edirlər.[307]

İslam alimlərinin icmasına görə, Ayın yarılması Rəsulullahın möcüzəsidir. Bütün müfəssirlər də bu mövzuda həmrəydir. Təkcə Osman ibn Atanın atası bu hadisənin gələcəkdə baş verəcəyini bildirmişdir.[308]

Quranda Ayın yarılması Qiyamətin yaxınlaşması ilə bir yerdə verilmişdir. Ayın yarılması Rəsulullahın peyğəmbəriyinə işarədir. Rəsulullah isə Qiyamət yaxınlaşarkən son peyğəmbər olaraq göndərilmişdir. Yəni Onun göndərilməsi Qiyamət əlamətlərindəndir.

Bütün bunlardan aydın olur ki, "Məalçılar" Allahın Kitabına ümumi prinsiplər nöqteyi-nəzərindən yanaşmırlar. Buna görə də, ayələrdə nəzərdə tutulan İlahi muradı başa düşə bilmirlər. Onlar fasid təvil və izahları ilə Qurandan xəbərsiz olduqlarını göstərirlər.

---

306. Bax: Taki Osmani, *Təkmilətu fethil-mülhim*, Darul-qaləm, Beyrut, 2006, VI, 74.

307. Taki Osmani, *e.ə.*, VI, 74.

308. Şövqani, Fəthul-qadir, V, 169.

**Mələklərin enməsi**

Uca Allah müsəlmanlara Bədir döyüşündə min,[309] üç min, sonra da beş min[310] mələklə kömək etmişdir. Mələklər səhabələrlə birgə kafirlərlə döyüşmüşdür. Bəzi alimlərə görə, mələklər cihad meydanında mükafatını ancaq Allahdan gözləyərək mübarizə aparanlara Qiyamətə qədər kömək edəcək.[311]

Sünnəni inkar edən "Məalçılar" Bədirdəki bu möcüzəni "mənəvi kömək" şəklində təhrif edirlər. Əsas olaraq da, **"Ondan (Həbibi Nəccardan) sonra tayfasının üstünə göydən heç bir qoşun göndərmədik və heç göndərən də deyildik."**[312] ayəsini göstərirlər.

Onların dəlil göstərdiyi ayədəki "عَلَيقَوْمِهِ" ifadəsində "ه" əvəzliyi, "min əqsal-Mədinə/şəhərin ən uzaq yerindən" gələn və xalqına: **"Sizdən (haqqa dəvət müqabilində) heç bir muzd (mükafat) istəməyən və özləri də doğru yolda olan kəslərin ardınca gedin!"**[313]deyən Həbib Nəccara[314] aiddir.[315] Ayədən Həbib-Nəccərın qövmü nəzərdə tutulmuşdur. Yəni ayədə bildirilir ki, Uca Allah Həbib-Nəccarın qövmünə bundan sonra heç bir qoşun göndərməyəcək. Bu o demək deyil ki, müsəlmanlara kömək üçün mələklər endirə bilməz. Sonrakı ayədə Həbibin qövmünün səslə həlak olduğu açıqca bildirilir: **"(Onların cəzası) ancaq dəhşətli (tükürpədici) bir səs oldu. Dərhal məhv olub (şam kimi sönüb) getdilər."**[316]

---

309. Ənfal, 8/9.

310. Ali-İmran, 3/124-125.

311. Bax: Qurtubi, əl-Camiu li-əhkamil-Quran, Darul-qutubil-ilmiyyə, Beyrut, 2000, IV, 124-125.

312. Yasin, 36/28.

313. Yasin, 36/21

314. Həbib ən-Nəccarın yerinə başqası olsaydı belə məna yenə də dəyişməyəcəkdi.

315. Nəsəfi, *Mədarikut-tənzil*, IV, 11.

316. Yasin, 36/29.

Bütün bunlardan görürük ki, "Məalçılar" möcüzələrlə yanaşı bir çox əqidə məsələlərini inkar edirlər. Bu da onların Qurandan xəbərsiz olduğunu göstərir. Əgər Həbibi-Nəccar haqqındakı hadisəni başdan axıra kimi oxusalar, Allahın bəzi qövmləri dəhşətli səs, yerə batırmaq, suda boğmaq[317] kimi müxtəlif şəkillərdə həlak etdiyini, həmin ayənin də Nəccarın qövmü ilə əlaqəli olduğunu başa düşərlər. Rəsulullaha mələklərin kömək etməsini inkar etməzlər.

**Bədirdəki möcüzələr**

Quranda Rəsulullahın möcüzəsi olaraq göstərilən başqa bir hadisə Bədirdə müsəlmanların kafirlərə sayca az göstərilməsidir.[318] Müharibə başlayandan sonra müşriklər, müsəlmanların sayca özlərindən iki dəfə çox – iki min nəfər görmüşlər.[319] Quranda bu hadisə belə xəbər verilir: **"(Ey Məkkə müşrikləri və yəhudilər!) İki dəstənin (Bədr müharibəsi zamanı) qarşı-qarşıya durması sizin üçün (Peyğəmbərin doğruluğuna) dəlildir. Bunlardan biri Allah yolunda vuruşanlar, digəri isə kafirlər idi. (Möminlər üç yüz on üç nəfər, kafirlər isə təqribən min nəfər idilər). (Möminlər kafirlərin) onlardan ikiqat artıq olduqlarını öz gözləri ilə görürdülər. (Yaxud kafirlər möminləri iki özləri qədər, yəni təxminən iki min nəfər və ya onların olduqlarından iki dəfə artıq, yəni altı yüzdən bir qədər çox görürdülər). Əlbəttə, Allah istədiyinə Öz köməyi ilə qüvvət verər. Şübhəsiz ki, bu (Bədr əhvalatı) bəsirət sahiblərindən (gözüaçıq, ayıq adamlardan) ötrü bir ibrət dərsidir."**[320] Uca Allah bildirir ki, müşriklərin müharibə başlayanda müsəlmanları sayca az, döyüş vaxtı isə iki dəfə çox görməsi açıq-aşkar möcüzədir.

317. Ənkəbut, 29/40.

318. Ənfal, 8/44.

319. Nəsəfi, *e.ə.*, I, 224.

320. Ali-imran, 3/13.

Rəsulullah Bədirdə müşriklərin üzərinə bir ovuc torpaq atmışdı. Onun atdığı torpaq müşriklərin gözlərinə dolmuşdu. Bu da bir möcüzədir.[321] Peyğəmbərdən başqa birisi bu torpağı atsaydı təsiri çox az olardı. Ancaq onu atan peyğəmbər olduğu üçün, Allah onun əli ilə müşriklərin gözünü torpaqla doldurmuşdur. Məhz buna görə Quranda, **"(Ya Peyğəmbərim! Düşmənlərin gözünə bir ovuc torpaq) atdığın zaman sən atmadın, Allah atdı."** buyrulmuşdur.[322]

## Nəticə

Quran tarixin böyük hücumları ilə qarşı-qarşıyadır. Bəzi insanlar Quranın tarixi kitab olduğunu, hökm etdiyi dövrün sona çatdığını, bəziləri qissələrin bir hissəsinin əfsanə olduğunu, Tövratdan götürüldüyünü iddia edirlər. Orientalist Rudi Paret kimi bəşəri bir kitab olduğunu deyənlər belə var. Qurana yönələn bu hücumlar nəticəsiz qalır. Şübhəsiz ki, bu, Əhli-sünnə alimlərinin səyləri nəticəsində deyil, Quranın Allah kəlamı olaraq qorunmasına görədir. Elm əhlinin üzərinə düşən əsas vəzifə Qurana yönələn iftiralara sələfi-salehin kimi dolğun cavablar verməkdir. Sualları cavablamaq, şübhələrə aydınlıq gətirməkdir. İndiki dövrdə Sünnəyə də müəyyən hücumlar başlayıb. Bəzi həddini bilməzlər Rəsulullahı tənqid etməyə, Onun etibarını zədələməyə çalışır. Bu iddia sahibləri Rəsulullahın "ümmi" və məsum olduğunu inkar edib, beləcə Onun günahkar ola biləcəyini və Ona itaətin lazım gəlmədiyini deyirlər. Onların məqsədi Peyğəmbərsiz "İslamın" ola biləcəyini göstərməkdir. Orientalistlərin Quranın başqa kitablardan köçürülməsi haqqındakı fikirləri də eyni məqsədə xidmət edir. Möcüzəni inkar etmək bir mənada, Rəsulullahın peyğəmbərliyinin dəlili olan İlahi təsdiqnamələri görməzdən gəlməkdir. "Quran müsəlmanları" möcüzələri ağıl və məntiqlə dəyərləndirməyi imanla əlaqələndirirlər. Halbuki, Quranda digər peyğəmbərlərin möcüzələrindən də bəhs olunur. Görəsən

321. Beyhəqi, *Dəlailun-nübüvvə*, H. No: 968; Qurtubi, VII, 244.
322. Ənfal, 8/17.

onlar buna nə deyirlər? Onlar Hz. İsanın ölüləri diriltməsini, kor və xəstələri sağaltmasını və beşikdə danışmasını necə izah edə bilərlər? Hz. Musanın əsa ilə daşı və dənizi iki yerə bölməsini, eyni əsanın sehrləri udmasını nə ilə açıqlayarlar? Hz. İbrahimin atəşdə yanmamasını, Hz. Yunisin balığın qarnından qurtulmasına hansı açıqlama gətirərlər? Rəsulullahın möcüzələrini ağıl ilə izah edə bilmədiklərinə görə, inkar edənlər sabah ayələri də inkar etməzmi? Bunu qeyd etmək yerinə düşər ki, möcüzə ağıla zidd deyil. Sadəcə həmin dövrdəki adət-ənənələrə zidd görünə bilər. Buna görə də, kiçik bir hüceyrədə insanın həyatını kodlaşdıran Allah, Bədirdə mələkləri endirməyə, Rəsulunun işarəsi ilə ayı iki yerə bölməyə də qadirdir. Möcüzələr möminlərin imanını artırır. Möcüzələri inkar cəhdləri Muhamməd Abduhla başlamışdır. Onların əsas məqsədi dini təhrif etməkdir. Ayın yarılması möcüzəsi həm Quranda, həm də Sünnədə bildirilmişdir. Bu haqdakı hədislər də mütəvatirdir. Heç bir hədis kitabında bunun əksini göstərən nəql yoxdur. Bu möcüzə Qurana zidd deyil, əksinə, tamamilə Qurana uyğundur. Hz. Musa qissəsində də ifadə edildiyi kimi, Firon möcüzələri inkar edəndə yox, bir müddət sonra suda boğulmuşdur. Nəticə olaraq, onların iddiaları Quran və Sünnəyə tamamilə ziddir.

# İSTƏKLƏRİNİ «ENDİRİLƏN", İSLAMI İSƏ «UYDURULAN DİN» ADLANDIRMAQ KİMİN PLANIDIR?

Oxuyacağınız bu yazı özünə müsəlman deyən və "Quran müsəlmanı" olduğunu iddia edən bir nəfərlə, bir elm tələbəsi arasında Ramazan bayramı günü baş verən dialoqdur.

* * *

**"Quran müsəlmanı":** Məal oxuyan, Quranda buyurulduğu kimi yaşayan bir müsəlman olaraq səni «uydurulan dindən» «endirilən dinə» dəvət edirəm. Quranda hər şey açıq-aşkar bəyan edilmişdir. İslamı anlamaq üçün başqa mənbəyə ehtiyac yoxdur. Xüsusən hədis adlandırılan «xürafələrə» inanmaq, onları dəlil saymaq və əməl etmək yeni din «uydurmaqdır».

**Uca Allah niyə mənası açıq olan Quranın yenidən izahını əmr edib?**

**Elm tələbəsi:** Quranda mütəşabeh[323] ayələr xaricindəki ayələrin mənası açıqdır. Bu, Quranı vəhy yolu ilə Allahdan alan[324] Rəsulullah vasitəsi ilə bildirilmişdir. Əgər Quranı Rəsulullah ol-

323. Ali-İmran, 3/7. (İzah və təvilə ehtiyacı olan, nəyin nəzərdə tutulduğu bilinməyən ayələrə mütəşabeh ayələr deyilir.)

324. Qiyamə, 75/19.

madan anlamaq mümkün olsaydı, Uca Allah **«Sənə də Quranı nazil etdik ki, insanlara onlara göndəriləni (hökmləri, halal-haramı) izah edəsən...”**[325] - buyurmazdı. Halbuki Uca Allah Quranı Rəsulullaha nə üçün endirdiyini bu ayədə açıq-aşkar bildirir: **“insanlara onlara göndəriləni (hökmləri, halal-haramı) izah edəsən...”**[326] Əgər dediyin kimi Rəsulullah olmadan Quranı başa düşmək mümkün olsaydı, səhabələr müəyyən yerləri anlamaqda çətinlik çəkməzdilər. Bəs Uca Allah niyə hər şeyi açıq-aşkar bildirdiyi bir Kitabı izah etməyi Peyğəmbərinə əmr edib? Yəni bilinən bir şeyin təkrar izahına ehtiyac var idimi? Bu mövzu aydındır.

**“Quran müsəlmanı”:** Açığı, bu məsələ haqqında belə düşünməmişdim. Ona görə də, bu haqda heç bir fikrim yoxdur. Suallarının cavabını Quran məalından araşdırmalıyam. Bundan sonra “Quran müsəlmanlarına” görə, bu mövzunun izahı haqqında fikir söyləyə bilərəm.

Rəsulullah “uydurulan dindəki” kimi dəstəmaz alıb?

**Elm tələbəsi:** Namaz qılırsan?

**“Quran müsəlmanı”:** Bəli, qılıram. Bu nə qəribə sual idi. “Quran müsəlmanı” təbii ki, namaz qılmalıdır. Bunun əksini düşünmək doğru deyil.

- Dəstəmaz alırsan?

- Bəli, alıram.

- Dəstəmaz alarkən ağzını və burnunu su ilə təmizləyirsən?

- Təbii ki, təmizləyirəm.

- Çox gözəl. Dəstəmaz alarkən ağızı və burunu su ilə təmizləmək haqqında bir ayə oxuya bilərsən? Qarşı tərəf təəccüblə baxır və deyir:

---

325. Nəhl, 16/44.

326. Nəhl, 16/44.

- İndi yadıma düşmür. Ancaq bu haqda ayə olmalıdır. Sadəcə mənim yadıma gəlmir və ya mən bilmirəm. Bu mövzunu da araşdıracağıma söz verirəm. Gərək daha çox məal oxuyum.

- İndiyə qədər dəstəmazı "uydurulan dinə" görə alırdın? Yəni demək istəyirəm ki, "Quran müsəlmanı" olduğunu iddia edirsən. Hər gün bir neçə dəfə dəstəmaz alırsan. Ancaq aldığın dəstəmazla əlaqəli sualın cavabını Quranda tapa bilmirsən. Bu çox təəccüblüdür.

- Bəli, haqlısan. Böyük insanlar unuda bilərlər. Bu normaldır. Araşdırıb cavab verəcəm.

- Bunu araşdırmağa ehtiyac yoxdur. Çünki dəstəmaz alarkən ağızın və burunun təmizlənməsi haqqında ayə yoxdur. Ayədə[327] bildirilir ki, dəstəmaz alarkən üzü, dirsəklər daxil olmaqla əlləri yumaq, başı məsh etmək və ayaqları yumaq lazımdır. Dəstəmaz haqqındakı ayədə ağız və burunu yumaq haqqında heç nə bildirilməyib. Yəni bu haqda ayə yoxdur. Onda belə çıxır ki, sən neçə ildir "uydurulan dinə" görə dəstəmaz almısan?

- Madam ki, israr edirsən. Bu sualı mənə "endirilən dini" öyrədən "müəllimimə" soruşub sənə cavab verəcəm. "Müəllimim" televiziya verilişlərində çıxış edir. Növbəti sualına keçək.

**Elm tələbəsi:** "Quran müsəlmanı" olduğunu deyirsənsə, bunu müəllimindən yox Rəsulullahdan soruşmalısan. Axı Quran sənin müəlliminə deyil, Rəsulullaha nazil olub. Uca Allah Quranı təbliğ və açıqlamaq vəzifəsini, ixtilaflı məsələləri həll etmək səlahiyyətini Peyğəmbərinə verib. Yəni hər hansı qaranlıq qalan məsələdə Rəsulullahın Sünnəsinə müraciət etməliyik. Çünki möminlərin müraciət edəcəyi iki əsas mənbə var ki, bunlar Quran və Sünnədir. Quranın hökmləri qiyamətə qədər davam edəcək. Rəsulullah isə indi aramızda olmadığına görə, Onun Sünnəsi, səhih hədisləri bizim üçün hakim olmalıdır. Uca Allah bu haqda belə buyurur: **"Amma, xeyr! (Ya Rəsulum!) Rəbbinə and olsun ki, onlar öz aralarında baş verən ixtilaflarda səni hakim**

327. Maidə, 5/6.

**(münsif) təyin etməyincə və verdiyi hökmlərə görə özlərində bir sıxıntı duymadan sənə tam bir itaətlə boyun əyməyincə, (həqiqi surətdə) iman gətirmiş olmazlar."**[328] Ayədə Uca Allah "səni hakim (münsif) təyin etməyincə" buyurmaqla Rəsulullahın hakim olduğunu bəyan edir. Bu təqdirdə hakim kim olmalıdır? Sənin "müəllimin", yoxsa Rəsulullah? Və yaxud kimin Kitabına müraciət edək? "Müəlliminin" yoxsa Rəsulullahın?

**"Quran müsəlmanı":** Təbii ki, Rəsulullaha nazil olan Kitaba müraciət etməliyik.

- O indi aramızda olmadığına görə, Sünnəsinə müraciət etmək məcburiyyətindəyik.

- Xeyir! Quran bizə kafidir. Həzrət Peyğəmbərin vəzifəsi də Quranı təbliğ etmək idi. O, vəzifəsini yerinə yetirib aramızdan ayrılıb. Quranda Rəsulullaha itaəti əmr edən ayələrdə əslində Qurana itaət etmək nəzərdə tutulur.

- Bunu nəyə əsasən deyirsən?

- Qurana əsasən.

- Ancaq Qurandakı bu ayə sənin dediyini təkzib edir. Üstəlik müsəlmanların müraciət edəcəyi iki mənbənin olduğunu bildirir: **"Ey iman gətirənlər! Allaha, Peyğəmbərə və özünüzdən olan ixtiyar (əmr) sahiblərinə itaət edin! Əgər bir iş barəsində mübahisə etsəniz, Allaha və qiyamət gününə inanırsınızsa, onu Allaha və Peyğəmbərə həvalə edin! Bu daha xeyirli və nəticə etibarilə daha yaxşıdır."**[329] Ayədəki "أَطِيعوا / İtaət edin" mənasındakı əmr feli iki dəfə işlənmişdir. İkinci felin əvvəlindəki "və" bağlayıcısı isə birinci feilə aiddir. "Və" bağlayıcısı eynilik bildirir. Bu isə o deməkdir ki, iki müstəqil dəlil var ki, bunlardan biri Quran, digəri də Sünnədir. Ayədəki "Allaha itaət edin" ifadəsi ilə Quran, "Rəsuluna itaət edin" ifadəsi ilə Sünnə nəzərdə tutulmuşdur.

---

328. Nisa, 4/65.

329. Nisa, 4/59.

- Açığı mənim oxuduğum məallarda bu cür izahlara rast gəlməmişəm. Bu məsələni də müəllimimdən soruşacam.

- Rəbbimiz "əgər bir iş barəsində mübahisə etsəniz, onu Allaha və Peyğəmbərə həvalə edin!" buyurmaqla açıq-aşkar "Quran və Sünnəyə müraciət edin" - deyir. Sən isə, "müəllimimə soruşacam" - deyirsən. "Müəlliminin" dediklərini də "Quran müsəlmanlığı" adlandırırsan. Təzadlar labirintindəsən.

- Yaxşı sən deyən olsun. "Müəllimimə" soruşmayacam. Dəstəmaz alarkən nə üçün ağıza və buruna su aldığımızı Qurana uyğun şəkildə mənə izah edə bilərsən?

- İcazənlə bir sual verim sonra izah edəcəm. Quranın Allah və Rəsuluna yəni Quran və Sünnəyə itaəti əmr etdiyini, Peyğəmbərin vəzifəsinin Quranı açıqlamaq olduğunu qəbul edirsən?

- Ayələri qəbul edirəm. Ancaq cavabsız suallarım var. Nə deyəcəyimi bilmirəm.

- Suallarını soruşa bilərsən.

- İnşallah sonra soruşaram. Mövzuya qayıdaq.

- Yaxşı, mövzumuza davam edək. Bütün mövzularda olduğu kimi dəstəmazın necə alındığını Quranın müfəssiri Rəsulullahdan öyrənməliyik. Quranda izahı olmayan məsələlərdə Onun Sünnəsinə müraciət etməliyik. Hədis kitablarında Rəsulullahın necə dəstəmaz aldığı ətraflı bildirilmişdir. Bildirilir ki, Rəsulullah dəstəmaz alarkən ağzını və burnunu su ilə üç dəfə təmizləyərdi.[330] Bir qrup insan Zeyd ibn Asim əl-Ənsaridən Rəsulullah kimi dəstəmaz almasını istədi. O, "bir qab su gətirin" - dedi. Su gətirdilər. Əllərini üç dəfə yuyandan sonra, ağzını və burnunu üç dəfə su ilə təmizlədi.[331] Yəni səhabələr Rəsulullahın yanında olan, dini hökmləri birbaşa Ondan öyrənən insanlardır. Onlar Rəsulullahdan öyrəndiyi şəkildə dəstəmaz alırdılar. Zeyd də məhz Rəsululahdan öyrəndiyi şəkildə dəstəmaz almış, ağzını və burnunu üç dəfə su ilə

330. Əbu Davud, Hədis No: 121.

331. Müslim, Təharət, 7.

təmizləmişdir.[332] Çünki səhabələr bilirdilər ki, Quranda Allah və Rəsuluna mütləq itaət əmr olunmuşdur. Onlar da bu əmrə tabe olurdular. Quranda alarkən ağızı və burnu su ilə yumaq haqqında ayə yoxdur. Onda belə çıxır ki, Rəsulullah "uydurulan dindəki" kimi dəstəmaz alırdı?

**Namazda "Sübhanəkə" duasını niyə oxuyursan?**

**"Quran müsəlmanı"**: İcazənlə başqa mövzuya keçək.

**Elm tələbəsi:** Yaxşı, sən deyən olsun. Namaza başlayanda "sübhanəkə" duasını oxuyursan?

- Bəli.

- Namazda "sübhanəkə" duasını oxumağa dair bir ayə göstərə bilərsən?

- İndi ağlıma gəlmir.

- Təbii ki, gəlməz. Çünki belə bir ayə yoxdur.

- Bəs niyə oxuyursan?

- Allahın Quranı izah etmək səlahiyyətini Rəsuluna verib. Allahın Rəsulu namazlarında "sübhanəkə" duasını oxuyub. Mən də buna görə, namazda "sübhanəkə" duasını oxuyuram. [333]

**Namazda "Fatihə" surəsini oxumaq haqqında ayə var?**

**Elm tələbəsi:** Namazın bütün rükətlərində "Fatihə" surəsini oxuyursan?

**"Quran müsəlmanı":** Bəli oxuyuram.

- Niyə başqa surə yox, ancaq "Fatihə" surəsini oxuyursan? Namazda "Fatihə" surəsini oxumaq haqqında ayə var?

- Xatırlamıram.

- Xatırlaya bilməzsən. Çünki belə bir ayə yoxdur.

---

332. İbn Hibban, *Səhih*, Hədis No: 1056.

333. Tirmizi, Hədis No: 243; Əbu Davud, Hədis No: 776.

- Bəs niyə namazda “Fatihə” surəsini oxuyuruq?

- Bu sualı sən özünə soruşmalısan. Eybi yox, mən cavab verərəm. Çünki Rəsulullah bir hədisində belə buyurmuşdur: *“Fatihə oxumayanın namazı sayılmır”.*[334] Hənəfilərə görə, bu hədisin dəlaləti qəti, vürudu isə qəti deyil. Bu səbəbdən hənəfilərə görə, namazda “Fatihə” surəsini oxumaq vacibdir. Yəni hənəfilər bu hədisi “Fatihə oxumayanın namazı kamil olmaz” şəklində izah etmişlər. Şafeilər isə, bu hədisi “Fatihə oxumayanın namazı batildir” şəklində şərh etmişlər. Qısacası hənəfilərə görə, namazda “Fatihə” oxumaq vacib, şafeilərə görə isə fərzdir.

- Dediklərini heç düşünməmişdim.

- “Quran müsəlmanlarının” məqsədi də sənin düşünməyinə mane olmaqdır. Sən düşünməyəsən deyə, səni alimlərdən uzaqlaşdırmışlar. Nəticədə yerli orientalistlərin dedikləri ilə oturub-durmaq məcburiyyətində qalmısan. Onlar da sənə Sünnəni inkar etməkdən başqa heç nə öyrətməyiblər.

**Namazda “Təhiyyat” duasını nə üçün oxuduğumu da bilmirəm.**

**“Quran müsəlmanı”:** Söhbətə davam edək?

**Elm tələbəsi:** Bəli. Namazda “təhiyyat” duasını oxuyursan?

- Əlbəttə oxuyuram.

- Quranda bu barədə ayə var?

- Yəqin ki, yoxdur.

- Yaxşı, “Quran bize kafidir. Quranda hər şey yazılıb”, - deyirsən. Bəs niyə Quranda olmayan duaları namazda oxuyursan?

- Heç özüm də bilmirəm.

- Nə üçün başqa dua yox, məhz “Təhiyyat” duasını oxuyursan?

334. Müslim, Salət, 11.

- Bilmirəm.

- Rəsulullah səhabələrinə belə demişdir: "Namazda oturanda "ət-Təhiyyatunu" oxuyun".[335] Biz də buna görə, namazda "Təhiyyat" duasını oxuyuruq.

**Yeddi şavt bir tavaf sayılır. Bu haqda ayə var?**

**Elm tələbəsi:** Həccdə olmusan?

**"Quran müsəlmanı":** Bəli.

- Təvafa[336] haradan başlamısan?

- Həcərul-Əsvəddən.

- Hamı ordan başlayırdı?

- Bəli.

- Təvafın ilk üç şavtında "rəməl"[337] etdin?

- Bəli.

- Yaxşı. Niyə tavafa Rüknü-Yəmanidən yox, Həcərul-Əsvəddən başladın? Hər ikisi Kəbənin yanında deyil? Niyə ilk üç şavtda "rəməl" etdin, digər dörd şavtda normal yeridin? Bunlarla əlaqəli ayə göstərə bilərsən?

- Sən de. Mən bilmirəm. Artıq hər şeydən şübhələnirəm. Sən demə, bizə "Quran müsəlmanlığı" adı altında öyrədilənlər yalan imiş. Öyrədənlərin məqsədi də dini əhya etmək (canlandırmaq, yaşatmaq) yox, təhrif etmək imiş. "Quran müsəlmanlığı" hərəkatı əslində İslamı təhrif hərəkatıdır. Bizi necə də aldadıblar. Sən

335. Müslim, Salət, 16.

336. Təvaf Kəbənin "Həcərul-Əsvəd" olan küncündən və ya eyni sıradan başlayaraq saat əqrəbinin əksi istiqamətində Kəbənin ətrafında yeddi dəfə dönməkdir. Hər dövrəyə "şavt" deyilir və 7 şavt bir təvaf sayılır.

337. "Rəməl" etmək təvafda qısa addımlarla və çiyinləri hərəkət etdirərək tez-tez qaçmaqdır. Təvafın ilk üç şavtında "rəməl" etmək sünnədir.

demə, bütün məsələlərdə inkar etdiyimiz Sünnəyə uyğun hərəkət edirmişik. Bizə Sünnə düşmənçiliyini öyrədiblər. Halbuki ibadətlərimizin hamısı Sünnəyə əsaslanır.

**Məni hidayətə qovuşduran Allaha həmd olsun.**

**"Quran müsəlmanı":** Yuxarıdakı sualın cavabını demədin.

**Elm tələbəsi:** Allah Rəsulu təvafa Həcərul-Əsvəddən başlamış və hər təvaf üçün Kəbənin ətrafında üç dəfə "rəməl" etmiş, dördüncüdə də normal yeriyərək yeddi dəfə təvaf etmişdir.[338]

- Deməli, bizi "Quran müsəlmanlığı", "endirilən din" adları ilə aldadıblar. Rəsulullaha düşmənçiliyə "İslam" donu geyindiriblər. Əmrlərinə tabe olacağımız Peyğəmbəri unudaraq, arzu və istəklərimizə uyğun öndərlər seçmişik. Üstəlik utanmadan buna "həqiqi din" adı vermişik. Vay bizim halımıza! Bütün ibadətlərimizi Sünnəyə uyğun etdiyimiz halda, Sünnəni inkar etmiş, Sünnəsiz İslamı müdafiə etmişik. Arzu və istəklərimizə "endirilən din", Rəsulullahın Sünnəsinə isə, "uydurulan din" demiş, özümüzü "ilah" yerinə qoymuşuq. Şeytanın ən böyük tələsinə düşmüşük. Məni hidayətə qovuşduran Allaha həmd olsun!

* * *

338. Malik, *Muvatta*, Hədis No: 1341; Əhməd ibn Hənbəl, *Müsnəd*, Hədis No: 13918.

## MÜNDƏRİCAT